# Molla Nəsrəddin



# ملّا نصرالدّین

Hazırladı: Cavid Ağa

اغآ دیواج :یدالرضاح

15 şaban 1328 **Beşimci il** 8 августа 1910 г.

# ملا نصر الدين

**№31 Qiymәti 12 qәpik.** **МОЛЛА НАСРЕДДИНЪ** **Цена 12 k. № 31**

Доктор медитсин «Tarax-Turux» Hacıkәndindә xolera leksiyası oxuyur.
Докторъ «Тарахъ-Турухъ» читаетъ лекцию в Аджикенте о холере (11 июля).




Litoq. S.Bıxova

Суетливо быстрыми шажками поднялся онъ на кафедру и гордо началъ такъ:

«Великие Демосфенъ рождается въ тысячилетие разъ Волей Зевеса летъ 28 назад былъ признанъ я съездом ораторовъ всемирнымъ после первого вторымъ. За искусство это въ чинъ генерала отъ дизентерии возведенъ былъ я. Ныне все и младъ и старъ твердятъ: самъ доползъ до него, никто тебя за уши не таскалъ».



## ƏDƏBİYYAT

### Amma millət a!..

Moldayı, gördün nə iqdam etdi?.. Amma, millət a!!.
Az zamanda nə sərəncam etdi?!. Amma, millət a!!.
Öz gücün hər qövmə ifham etdi?!. Amma, millət a!!.
Varlığın mərdanə elan etdi!!. Amma, millət a!!.
Moldayı, gördün nə iqdam etdi?!. ... Amma, millət a!!.

Basdı keçdi, əhli-İran qatladı hər milləti,
Bildi qədrin (?), aldı haqqın (?) qovzadı milliyyəti (?)
Aldığı məşrutəni partlatdı (?) parlaq qeyrəti,
Əhsənüllah himməti-tam etdi!! Amma, millət a!!.
Moldayı, gördün nə iqdam etdi?!. ...Amma, millət a!!.

İş başında əyləşən kəslər xəyanətdən səva,
Bay, yanıldım!.. Qoy deyim! Hə, lap sədaqətdən səva,
Etməz oldu bir nəfər olsun da xidmətdən səva (!)
Var-yoxun həp bəzli-islam etdi!!. Amma, millət a!!.
Moldayı, gördün nə iqdam etdi?!. ...Amma, millət a!!.

Əql heyrandır ki, saysın bir-bir əhrarın işin,
Qanmaq olmur, anlamaq olmur Sipehdarın işin,
Yefremin, ya Bağırın, yainki Səttarın işin.
Mərhəbalar!.. Vəh nə əncam etdi?! ...Amma, millət a!!.
Moldayı, gördün nə iqdam etdi?!. ...Amma, millət a!!.

Eyləsin Səttarü Bağır başqa bir ima neçün?
Ya hökumət eyləsin əhrar ilə dava neçün?
Qanmıram, əlqissə, sərdar Bəhadır ya neçün
Bağırı təslimi-Səmsam* etdi?!. Amma, millət a!!.
Moldayı, gördün nə iqdam etdi?!. ...Amma, millət a!!.

Get, daha ol arxayın, yat, eyləcə sərsəm kişi!
Parladı, meydana çıxdı millət, etmə qəm, kişi!
Qoy bizi təqdir edib də söyləsin aləm, kişi!
İktisabi-izzəti-nam etdi amma, millət a!!
Moldayı, gördün nə iqdam etdi?!. ...Amma, millət a!!.

..........

*Səmsamüssəltənə – sərdar Bahadırın pədəridir.

## TƏZƏ XƏBƏR

Qardaşlar, bu gün bir təzə xəbər eşitmişəm. Doluşun başıma nağıl eləyim.

Bu xəbəri «Tərcüman» qəzetəsində oxudum.

Əhvalat budur ki, Baronessa Rozen adında bir nemes xanımı «Tərcüman» qəzetəsinin sahibinə bir belə məktub yazıb:

«Cənab mühərrir, mən otuz yaşında bir övrətəm, özüm də oxumuş və dövlətli. Fikrim budur ki, bir müsəlmana ərə gedəm və islamı da qəbul edəm, ancaq bir məsələ qabağımı kəsir: əgər mən müsəlman olandan sora başıma çaharşov salıb üzümü örtsəm, gərək dünyadan əl çəkəm və mülk-maaşımı atam ərimin üstünə.

Bu da mənim üçün böyük zülmdür, çünki otuz il açıq və azad yaşayan bir şəxsin başına çaharşov salıb dama qatmaq onu öldürmək kimi bir şeydir».

---

Vaqeən çox çətin məsələdir. Mən and içərəm ki, indiyədək «Tərcüman» qəzetəsinin sahibi bir belə müşkül işə rast gəlməyib. Biçarə neyləsin? Və Baronessa Rozen xanıma nə cavab versin? Buna hicab məsələsi deyərlər, zarafat deyil, burada politika lazımdır.

Məlum şeydir ki, burada İsmayıl bəyin cavabı iki qisim ola bilərdi: ya hə, ya yox, yəni, «Tərcüman» sahibi Rozen xanıma cavab verə bilərdi ki, «ey möhtərəmə xanım, islamı qəbul eləməkdə və müsəlman kişisinə ərə getməkdə gözüm üstə yerin var, amma söz yox ki, müsəlman olandan sora gərək üzünü örtəsən və naməhrəm kişilərə görsənməyəsən».

Aya bu cavabı «Tərcüman» sahibi verə bilərdi, ya yox? Mən deyirəm ki, verə bilməzdi: ondan ötrü ki, əgər İsmayıl bəy belə cavab versəydi, o vaxt İsmayıl bəyi yavıqdan tanıyanlar da yapışardılar onun yaxasından və deyərdilər: «Ey əzizim, sən ki, hicab məsələsini belə kəşf eləyirsən, pəs nə səbəbə...»

Hədise-dust nə guyəm məgər behəzrəti-dust
Ke, aşena süxəni-aşena nigəh darəd*.

Mən sözümün qurtaranında bir neçə nöqtə qoydum, yəni mətləbi axıra kimi söyləmədim, çünki aralıqda yad adamdlar var. Dostun da sirrini yada vermək namərdlikdir.

---

Bəli, ya gərək İsmayıl bəy belə cavab verəydi, ya da deyəydi ki, «gözəl xanım, heç eybi yoxdur, sən islamı qəbul elə və bir nəfər mömin kişiyə də ərə get, sora istəyirsən üzüaçıq gəz, istəyirsən üzüörtülü gəz, o baxır sənin ağlına, şüuruna, qabiliyyətinə, tərbiyənə, insaniyyətliyinə, səliqənə, məzaqına və xülaseyi-kəlam, nə cür kefindir elə də rəftar elə.»

Yox, bu cavabı «Tərcüman» sahibi verə bilməzdi.

---

*Tərcüməsi: Dostun sözünü (sirrini) həzrət dostdan başqasına deməərəm, çünki, aşina (dost) aşinanın (dostun) sözünü (sirrini) qoruyar. *(Red. T.K.)*

Bəs neyləyim? Elə yazma – cavanlar inciyərlər, belə demə – qırmızısaqqallar inciyərlər. Mən də acıqnan deyirəm ki, «Nəmidanəm. Qoy Rozen xanım yazsın, bu məsələni prixod mollalarından və müctəhidlərdən xəbər alsın. Əgər belə cavab gələr, belə eləsin, elə cavab gələr, elə eləsin, kaş mənim yaxam qurtarsın.»

Cənab İsmayıl bəy belə deyir və belə eləyir: özü Baronessa Rozen xanıma cavab verməkdən, deyir «qoy məsələyə müctəhidlər cavab versinlər». Yəni bundan bu çıxır ki, «mən bilmirəm», yəni bundan bu çıxır ki, otuz il «Tərcüman» qəzetəsini yazan və indi də «Aləmi-nisvan» məcmuəsini çıxardan məşhur bir mühərririmiz hicab məsələsini örgənməyib.

---

Bəs yazıq Molla Nəsrəddin başına nə kül eləsin? «Tərcüman» sahibi İsmayıl bəyin möhtərəmə qızı Qafqaza gəlib müsəlman xanımlarını azadlığa və üzüaçıq kişilərə görsənməyə dəvət eləyəndə hələ Molla Nəsrəddin anadan olmamışdı. Amma Qafqazda hicab məsələsi söhbəti düşəndə lənəti əvvəl, qabaqca Molla Nəsrəddinə oxuyurlar. Molla Nəsrəddin də «Tərcüman»ları köməyə çağıranda, onlar da özlərini qoyurlar bicliyə. İndi bəs mən neyləyim və sözümü kimə deyim?

Nələr çəkdim, əzizim, sormadın hali-pərişanım,
Böyük bir dərdə düşdüm, qılmadın tədbiri-dərmanım.
Bu işlər böyləmi qalsın, sözün nə, ey gözəl xanım?
Gözüm, canım, əfəndim, sevdiyim, dövlətli sultanım.

*Molla Nəsrəddin*

---

## GÖYÇAY XƏBƏRLƏRİ

Göyçayda bir elə qabil əhvalat yoxdur ki, yazam, ancaq bircə odur ki, hamamçı Məşədi Qəni «Molla Nəsrəddin» jurnalını görəndə elə bil Qulamhüseyn dayısını görür. Elə çəpəki baxır ki, az qalır gözləri çıxıb düşsün yerə. Bir də bəzi vaxt olur ki, səhər ertə gəlib durur poçtun qabağında, poçtdan çıxan «Molla Nəsrəddin»i iki qiymətinə alıb cırır. Camat da elə bilir ki, Məşədi Qəni əmi jurnala düşmənçilik eləyir. Vallah elə deyil. O istəyir ki, «Molla Nəsrəddin» çox satılsın. Çünki o nömrələri oxumaq istəyənlər məcburdurlar ki, yazıb bir də alsınlar. Allah belə himmətli kişilərin bizim içimizdə yüzünü bir eləsin, amin!

*Məşədinin hamam müştərisi*

---

## POLİTİKA İŞLƏRİ

Keçən il Aşqabadda İran konsulu İsmayıl xan Möhtərəmülmülk deyirdi ki, konsulluğu üç min manata alıb. Bir ildən sora buna dedilər ki, ərbab, xoş gəldin, indi təşrif apara bilərsən, yerin özgəsinə vəd olunubdur. Biçarə nə qədər dad-fəryad elədisə də, içindən bir zad çıxmadı. Dedilər ki, bir il konsulluğun qiyməti bundan ucuz olmaz ki?! Dəxi nə istəyirsən?..




– Cənab İsmayıl bəy! Mən istəyirəm islamı qəbul edəm və bir müsəlmana gedəm. Ancaq hicab məsələsi qabağımı kəsir. Əgər otuz yaşında başıma çarşov örtməyə başlasam, o vaxt gərək cəmi işimdən-gücümdən əl çəkəm.

İsmayıl bəy (mollalara) – Təvəqqə edirəm bu xanıma cavab verəsiniz. Çünki sizin ayağınız biləni bizim başımız bilməz.

Söz yox, axırda belə olacaq.

Şuşa şəhərində qiraətxana.




Ay qardaş, o lüleyni ver bura.




Söhbət: Qarınca Süleyman peyğəmbərə dedi: – Sən böyüksən, ya sənin atan?
Süleyman buyurdu... (məbədi həmin nömrədə).

Molla əmi, görəsən indi konsulluğun məzənnəsi neçədir?

---

Aşqabad – Cəmi Aşqabadda dərs oxumuş və gimnaziya tamam etmiş bir müsəlman qızı vardır, bu da Mədinə xanımdır. Məzkurə qız keçən ildə Aşqabad mədrəsəsini əla dərəcədə medal ilə tamam edibdir. Mədinə xanım Firudini məktəbində ayda qırx manata dərs verir idi. Bu müəllimə də ekonomiya qurbanı oldu; yəni bu il may ayında o biri müəllimlər ilə bahəm işqolladan xaric olundu ki, yay fəsli nahaq yerə buna məvacib verilməsin.

Dərs oxumuş müsəlman qızlarına artıq hörmət olunur.

---

## EVLƏNMƏK

Mən özüm göyərçin saxlamışam. Quşbaz dilində göyərçinin dişisinə maya deyirlər. Məsələn, indi istəyirsən ki, külli-mayanı cift edəsən ki, maya bala versin. Onun yanına salırsan bir erkək. Baxırsan, bir gün, iki gün, bu erkək nə qədər o mayaya təməllüq edir və üzündən öpmək istəyir, amma maya qəbul etmir, dimdiyilən vurub onu qovalayır. Sora bir özgə maya salırlar ki, bəlkə onunla cift ola, görürsən onu da maya bəyənmədi, vurdu qovaladı.

Qərəz, bir neçəsindən sora axır birin bəyənib onunla cift olur və elə də olur ki, elə əvvəlinci ilə cift olur. Məqsəd odur ki, quşların əksəri belədir ki, dişi hansı erkəyə meyl etsə, onunla cift olur, onlarda güc-filan yoxdur.

Qaldı insan, insan da vəhşilik vaxtında ki, mütəfərriq meşələrdə, çöllərdə, mağaralarda yaşayırlardı, onlarda da zor heç yox idi. Yəni bir dişinin meyli olmamış bir erkəklə cift olmazdı. Darvin və özgə sosioloqlar da bunu sosioloji elmilə sübut eləyiblər və habelə növi-insanın mədəni vaxtında da nə qədər qanunlar yazılıbsa, hamısında yazılıb ki,gərək övrətin də izni ola ki, bunu bir kişi təsərrüf edə.

Bütpərəst, yəhudi, məcus, nəsara hamısı belədir. Allahın islam şəriətində də elə belədir. Qızın iqrarı olmamış kəbin dürüst olmaz. Hətta Ərəszadə də öz kitabında yazır: «Həddi-buluğa çatmış qızı ata, baba, əmi, dayı, ya başqa əqraba evləndirsə, qız özü razı olmasa əqd batildir».

Qərəz, bunların hamısı belə. Amma «Şeytanbazar qanunu» başqadır. Keçən cümə axşamı Şeytanbazarda, yəni müsəlman məhəlləsində bir qəribə toy oldu. Yəni Məhəmməd əmi buna toy deyir, amma qız təziyə deyir. Hər nə isə əhvalat belədir: qızın ata-anası yoxdur. Amma özünün rusca, müsəlmanca bir az məlumatı var. Məhəmməd kişi qızın əmisinə adam göndərir ki, övrətim İranda ölüb, Allahın əmrilə, peyğəmbərin şərilə qardaşı qızın ver mənə.

Bağır əmi deyir baş üstə. Qız diyir mən getmirəm. Əmisi diyir niyə? Qız deyir: Mən hər gecə rəng-həna qoya bilmərəm. Məhəmməd kişi and içir ki, vallah rəng-hənanı Şahbaz hamamında qoydururam.

Qız deyir onda elə hər işini də orada gör. Bağır əmi deyir: gərək gedəsən! Qız deyir: getmirəm! Burada qız doyunca bir kötək yeyir. Sora iş gəlir kəbinə. Gəlirlər qızdan iqrar almağa ki, kəbin kəsməyə, qız pavano atır. Deyir ölsəm də babam yaşda kişiyə getmərəm! Diyirlər niyə? Diyir gedib tumanbağı bitləyə bilmərəm. Buna qulaq asan olmur, imanlı camaat şəhadət verir, kəbin kəsilir. Gəlir toy gecəsi. Qız diyir ölləm, getmərəm. Mən gedib kimin təndirinə onun köynək-tumanının bitini çırpacam? Əmisi deyir getməsən öldürrəm! Yandan deyirlər: ay Bağır əmi, axır qız bəyənmir; niyə verirsən? Cavab verir ki, ondan yaxşı kimdir? Aparım verim indiki cavanlara ki, oruc tütmurlar, namaz qılmırlar, üzlərini də qırxdırırlar? Hazır verrəm Məhəmməd kişiyə ki, ömründə bir dəfə namazı qəzaya qalmayıb (hələ bu Bağır əmi özü evin fahişəxanaya kirayə verib. Bu başqa məsələ).

Qərəz, olur toy gecəsi. Qızı qapaz altında götürürlər pilləkanın başına. Qız deyir ölləm düşmərəm! Burada genə Bağır əminin tapançasının qorxusundan və üç övrətin sürüməyilə pilləkandan düşür, gəlir durur Məhəmməd əmi olan evin qapısında. Burada çox möhkəm dayanır. Burada çox qiyamət olur. Yəni nə qiyamət olacaq? Ağlaşırsa da xristian övrətləri ağlaşır, müsəlmanlar üçün ki, toydu!!! Axır genə də zornan qızı ağlada-ağlada salırlar içəri. Övrətlər nə qədər diyirlər ki, ay qız, ağlama, adam öz toyunda ağlamaz. Qız cavab verir ki, nə toy? Ata-anam ki, məni yetim qoydu, vəfat elədi, o gecədən mənimçün bu gecə böyük təziyə gecəsidir.

Qərəz, qızı tapşırırlar Məhəmməd kişiyə. Qız Məhəmməd kişini heç ətrafına qoymur. On yaşında bir uşaq ki, evə girib çıxırmış, kəmali-safi dərunəliklə mənə söhbət edirdi ki, Məhəmməd kişi qızıl-gümüşü tökmüşdü qızın qabağına və özü də and içirdi ki, bu il Məkkəyə gedəcəyəm. Qız ağlaya-ağlaya cavab verirdi ki, Allah xatirinə məndən əl çək, yoxsa özümü öldürrəm. Kimdi sənin qəlyanını dolduran və öskürəyindən tökülən bəlğəmləri silən? Qərəz, qız hələ ki, qəhrəmananə durub və müsəlmanlar da uzaqdan tamaşa edirlər; kəbin kəsənlər də gətirdikləri qənd ilə şirin çay içirlər, şahidlər də deyirlər «qız, üzün yerdə qalsın», nə həyasız qızsan! Allah, sən saxla, nə pis zəmanədir! Məhəmməd kişinin də sinəsi qızın təpiyindən başqa bir şey görməyib.

*Qızdırmalı*

---

## QORXURAM

Cənab Molla əmi! İstəyirəm əlimə qələmi alıb sizə bir neçə əhvalatlardan yazam, amma qorxuram.

Məsələn, Şəkili kəndinin mollası Hacı Mir Əfəndi üç talaqdan boşanan övrəti genə haman zövcəsinə əlli manat alıb kəsdiyi nikahından yazmaq istəyirəm, qorxuram. Yazmaq istiyirəm ki, Şahlı kəndinin mollası Molla Əziz nişanlı qızı özünə zor ilə almaq istəyir, qorxuram. Molla əmi, çünki həmən molla dua yazmaqda məşhurdur, qorxuram.

Genə istəyirəm ki, meydanda bir nəfər dindar Hacının dükanında özü kimi Hacılar və alimlər ilə maarifə zidd olan söhbətlərindən yazım, genə qorxuram.

İstəyirəm bu əhvalatlardan sizə həmişə yazam, ancaq qorxuram. Qərəz, qalanın da kefim gələndə yazaram.

*Aciz*

---

## TELEQRAF

Mosuq – Mənabedən alınan xəbərlərə görə ramazanın yaxınlaşması münasibəti ilə İran mollaları Qafqaz müsəlmanlarının üzərinə hücum etməyə hazırlaşırlar.

---

Şamaxı – Sarıtorpaq məhəlləsinin şeyxi İbrahim kişi, camaata rəhmi gəlib xolera azarına mübtəla olmasın deyə, dünən qovun yeməyi şədid qadağan buyurdular. Hərçəndi ki, şeyxin buyuruğuna qovun yeyən kimsəyə yetmiş həsənə yazılıb və hamı günahları Allah dərgahında əfv olunar, amma nə çarə? Lazım gəlir ki, vəba şəhərdən çıxıb gedənə kimi camaat qovun yeməyib və günah əmələ də mürtəkib olmasınlar.

---

Culfa – Təbriz yolunun idarəsi qoymur ki, tacirlər mallarını dəvə və furqon ilə göndərsinlər. Deyir ki, hökmən gərək avtomobil ilə göndərəsiniz! Buna da tacirlər razı olmurlar, çünki zərər eləyir. Buna görə Culfa və Təbriz tacirləri bir şirkət təşkil eləyirlər ki, tez bir zamanda Culfadan Təbrizə qədər elektrik dəmir yolu çəksinlər.

---

28-ci nömrədəki tapmacanın cavabı:
Arifləri görcək pozulub rəngi qaçanlar,
Cahilləri görcək sevinib şad olanlar,
Tədqiq olunsa, bulunur; vaizü dindar,
Həp qırmızısaqqal Hacılar, mərsiyəxanlar.

*Hatif*

---

## TƏBRİZ XƏBƏRLƏRİ

Bələdiyyə tərəfindən Ərdəbildə vəba münasibətilə Şibli gədiyinə qarantiyadan ötrü on iki atlı və iyirmi sərbaz göndərildi. Sərbazların çoxu qoca və təcrübəli olmağına görə doktor göndərilmədi, çünki onlar həkimlik də edə bilərlər.

---

Seyyidülmühəqqiqi ağa ramazandan ötrü təzədən bir arvad aldı və buna görə ağa əcələtən Əncüməndən istefa verdi.

---

Mirzə ağa ədliyyənin sabiq müfəttişinə ki, ədliyyədə qırx tümən məvacib alırdı, «Mühakimat» ruznaməsinin müdiri Mirzə Mahmudu döydürməyə görə maliyyə idarəsinə aparıb «amin bəqayə» ləqəbilə doxsan tümən izafeyi-məvacib təyin oldu.

*Təzə dəli*

---

## HACIKƏND (GƏNCƏ)

11 iyulda buranın klubunda ədəbiyyat və sənayeyi-nəfisə həvəslilərinin cəmiyyətinin üzvü, Gəncə «Demosten»i doktor Tarax-Turux xolera leksiyası oxudu. Klub adamnan doluydu. Demosten söhbətini belə başladı: «Qaspoda, qaspajalar, 28 il bundan qabaq mən Üçkilsədə fizika dərsi deyirdim. Amma dilim topuq çaldığına görə fikrimi yerinə yetirə bilmirdim, heç kəs də bir söz annamırdı. Axırda, şükür Allaha, fəndini öyrəndim, dilimin altına daş qoymaqnan elə ustalaşdım ki, Məlikülmütəkəllimin nədir, lap Demosten oldum. İnanmırsınız qulaq asın: xoleradan qorxmayın, Qarabağ və Şuşasına xoleri qoymayan mən idim. Quberniyamda da indi yoxdur. Yevlaxdan-zaddan gələn səslərə inanmayın, bunlar hamısı düşmən sözüdür. Həkimlər xolera mayası-zad söyləyirlər. Mən xolera mayasına inanmıram, siz də inanmayın, boş şeydir. Yemiş yeməyin, qarpız yeyə bilərsiniz. Xolera mikrobu palçıqda da artar. Buna görə qaloşun da xətası xolerada çoxdur; qaloşa dolub o yan-bu yana dağıla bilər. Sizə artıq başağrısı vermirəm. Nə qədər mən varam, buralarda xolera-molera ola bilməz. Süleymani Kərbəladan təmiz dağıdaram xoleri... Vəssalam cüt tamam.»

*Hacıkəndli*

---

## POÇTA QUTUSU

Naxçıvanda «Gözüqıyığ»a: Kağızını oxuduq, bəzi mətləbləri danışarıq.

---

Bakıda «Bibak»a: Yazırsan ki, Məşqətə kəndində Keçəl məhəlləsinin yanında bir nəfər mömin pul icarəyə verəndə öz oğlu mollaya məsləhət edib şəri elətdirir. Pul işi ötüşər, özgə zadları şəri eləməsin.

---

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*

## ELANLAR



Batum
Батумъ

Vağzal
Вогзалъ

Hacıların intizarında
Въ ожидании поломниковъ

Batum qəssabları.
Батумские мясники.

# ملا نصرالدين

**№32 Qiymәti 12 qәpik.** **МОЛЛА НАСРЕДДИНЪ** **Цена 12 k. № 32**





Qızımı bu neçә müddәtdә elә bәrk saxlamışdım ki, onun üzünü quş da görmәmişdi.
Axırda namәrd fәlәk qızımı görsәtdi.

## ƏDƏBİYYAT
## VAXTDIR

Gəldi orucluq, genə bir fənd elə,
Söhbətinə aləmi həsbənd elə.

Aç dəhəni-pakını, eylə nisar,
Məxzəni-sinəndə nə cövhər ki, var,
Ləli-Bədəxşanü düri-şahvar
Məclisi çün qəndi-Səmərqənd elə,
Söhbətinə aləmi həsbənd elə.

Vədeyi-cənnət verib əyanlara,
Bəxş elə huriləri nadanlara,
Cud ilə can ver yarımcanlara,
Möcüzü İsalara manənd elə,
Söhbətinə aləmi həsbənd elə.

Fikrini vəzinlə qarışdırgilən,
Yatma özün, xalqı yatışdırgilən,
Bir-birə dünyanı qarışdırgilən.
Lənəti təkfir ilə peyvənd elə,
Söhbətinə aləmi həsbənd elə.

Sövq elə bu taifəni yatmağa,
Cəhd elə yuxlatmağa, ağlatmağa,
Soymağa, cülbəndinə əl qatmağa,
Boş söz ilə onları xürsənd elə,
Söhbətinə aləmi həsbənd elə.

Ərz, səma, lövh, qələmdən danış,
Ağ dəvədən, bağı-İrəmdən danış,
Lap düzü dinarü dirəmdən danış.
Şivəni bir tövr xoşayənd elə,
Söhbətinə aləmi həsbənd elə.

Əlqərəz, aç söhbəti ehsandan,
Söylə bütün firni, fisincandan,
Kəlmə demə elmdən, ürfandan
Həm də qəzet, jurnala rişxənd elə
Söhbətinə aləmi həsbənd elə.

İşləmə əbnayi-müsəlman üçün,
Məsələyi-məktəbi-nisvan üçün,
İşlə, fəqət nəfi-cibişdan üçün.
Qəsbi-hüquqi-zən, fərzənd elə,
Yığ hamını, bir dama qat, bənd elə.
Molla kişi, moizə qıl, pənd elə,
Hiylə elə, bijlik elə, fənd elə,
Söhbətinə aləmi həsbənd elə.

*Kefsiz*

## MOLLA

Bir gün yolum düşdü Malıbəyli kəndinə. Kəndi gəzdim və elə şeylər gördüm ki, qeyri müsəlman kəndində onları görmək olmaz. Əvvəla, burada bir məktəb var, bu məktəbdə çox oğlan uşağı oxuyur. Uşaqların ataları ilə danışıb gördüm ki, hər bir kəs ki, oğlunu oxumağa qoyub, çox razıdı ki, onun övladı elm oxuyur. Bu da görsənməyən bir işdir, çünki özgə müsəlman kəndlərində çox adamlar uşaqlarını məhz o səbəbə məktəbə göndərirlər ki, evdə bikar qalıb anasından çox çörək istəməsin.

Hələ bu qəribə iş deyil. Malıbəylidə bir qəribə əhvalat gördüm. O



da budur ki, bu kənddə hələ oğlan uşaqlarından savayı qızlar da məktəbə gəlib dərs oxuyurlar. Doğrusu, çox təəccüb elədim ki, məsələn, İrəvan kimi bir müsəlman mərkəzində qızın oxumağını müsəlmanlar pis iş hesab eləyirlər. Amma Malıbəyli kimi bir kənddə qızlar erməni haxçığı kimi çiyninə heybə salıb dərsə gedir.

Bu işləri görüb, söz yox, başladım bunun səbəbini soruşmağa ki, çox əcəb, Malıbəyli hara, bu işlər hara? Və gün hardan çıxıb ki, burada bu qədər tərəqqi baş verib? Hər kəsdən xəbər aldım, mənə cavab verə bilmədi. Doğrudan da qəribə işdir ki, müsəlman kəndində belə-belə işlər əmələ gəlsin. Axırda nə oldusa, söhbət molladan düşdü və belə məlum oldu ki, Malıbəylidə heç əslindən molla olmayıb və malıbəylilər heç ömürlərində molla üzü görməyiblər.

Aha, burada mən barmağımı dişlədim və öz-özümə dedim ki, bəli, bunu mənə bayaqdan deyin. Allah atanıza rəhmət eləsin, indi bildim ki, niyə burada müsəlmanlar oğlanlarını və qızlarını oxudurlar.

Ondan ötrü ki, burada molla yoxdur.

---

Ancaq indi başa düşdüm.

*Cırcırama*

---

### İKİ ADAM

Qarabağda iki adam var ki, dinc oturmurlar ki, müsəlmanlar düz yolları ilə getsinlər. Biri müəllim Məhəmməd Qarayevdir ki, fikri-zikrini qoyub qız uşaqlarını oxutmağa. Bir də malıbəylili Məşədi Nəcəfqulu oğludur. Vəbalı deyənin boynuna, belə deyirlər ki, bu kişi öz əli ilə yapışır qızların əlindən və çəkə-çəkə aparır Qarayevin dağılmış məktəbinə.

Allah mərdümazara lənət eləsin.

*Həkim*

---

### CULFA

İran mollalarının qabaq dəstəsi yetişdi. Mollalar nəzr elədilər ki, Qafqazdan «cibi dolu», sağ və salamat qayıtsınlar, buranın mömin camaatına bir gecə məccani mərsiyə oxuyub müstəfyiz etsinlər.

### ŞER

Kim deyir daimi surətdə «Həqiqət» çıxacaq?
Yaşayıb kəsb edəcəkdir əbədiyyət, çıxacaq.
Əhəmiyyət qazanıb nəşr olacaqlar daim,
Qoyacaq millət özü onlara qiymət, çıxacaq.
Hər yetən naşiri-laməzhəbü bidini ləin
Başlayıb eyləyəcək xəlqi məzəmmət, çıxacaq.
Məgər aləmdə bütün xəlq olacaq laməzhəb?!
Gündə bir məzhəkə, bir nameyi-bidət çıxacaq?
Degiləm mən o qədər əhməqü kovdan, inanam –
Ona kim, bunlar ilə cəhl-cəhalət çıxacaq.
Nə qədər aləmi-tənqid olacaqdır, olsun!
Sanma bir zərreyi-asari-sədaqət çıxacaq.
Etiqadımca mənim küfrdü jurnal oxumaq,
Qəzetə, jurnal oxunduqca mərarət çıxacaq.
Babamız dinc gəlib ömr elədi dünyadə,
Bilmədi nəsllərində mədəniyyət çıxacaq.
Yaxamızdan bizim əl çəkməyəcək əhli-qələm,
Gündə bir cür qəzetə, bir cürə heyət çıxacaq.
Birisi şəkil çəkib eyləyəcək cızmaqara,
Hamısı məzhəkəvü həzlü zərafət çıxacaq
Biri ciddi yazacaqdır, soyacaq islamı,
Edəcək hər biri bir növ ticarət, çıxacaq.
Nəyə lazım oxumaq bir para hədyanatı?
Bizə nə, gündə nasıl şəkli-siyasət çıxacaq?
Bizə nə, ya gedəcək, ya qalacaqdır İran,
Ya ki, Osmanlıda min nəqlü hekayət çıxacaq.
Biz gərək dərk eləyək məsələyi-şərimizi,
Oxuyaq öylə əhadisi ki, cənnət çıxacaq.
Gedək həmmamə, yaxaq gündə həna saqqalə,
Gündə beş dəfə edək qüsli-cənabət, çıxacaq.
Yataq asudə, fəraqət, nəyə lazımdı təlaş?!
Ruzimiz həqqdən hər qədr ola qismət, çıxacaq.
Şeyx vəzində nə söylərsə deyək «səddəqna»,
Məscidə, mənbərə hər gün ki, o həsrət çıxacaq.
Qoy desinlər ki, Cüvəllağı olub divanə,
Dəftəri-eşqimi açdıqca nəsihət çıxacaq.

### PİŞİK

Uşaqlıqda nənəmiz bizimçün bir nağıl deyərdi, o nağılın başı bu idi ki, bircəciyi var idi, bircəciyi yox idi, bircə qarı var idi, bir gün getdi su üstə, sürüşdü düşdü buz üstə. Dedi: ay buz, sən nə zalımsanmış? Buz dedi: mən zalım olsaydım, gün məni əritməzdi. Dedi: ay gün, sən nə zalımsanmış? Dedi: mən zalım olsaydım üstümü bulut almazdı. Qərəz, bulut da bir başqasın zalım deyib. Axırı hamıdan zalım pişik çıxır. Amma hər kəs nağılı axıracan eşitməsə, təəccüb qalar ki, qarının yıxılmasının pişiyə nə dəxli.

İndi müsəlman qəzetlərinin bağlanmağında hər kəs bir tərəfi müqəssir hesab edir. Biz də başlayaq soruşmağa, görək təqsirkar kimdir.

– Ay əmələlər, niyə tətil elədiz, siz nə zalımsınız?

– Biz heç zalım deyilik, bizim zəhmətimiz çox, məvacibimiz az, xərcimiz çatmayır, qəzetəçilər zalımdırlar ki, məvacibimizi artırmırlar.

– Ay qəzetçilər, siz nə zalımsız, niyə əmələlərin məvacibin artırmırsız?

Haman millətpərəst student on ildən sonra.

Rotter

– Rusca danışın, rusca danışın, mən müsəlmanca bilmirəm. Tez sözünüzü deyin, cəhənnəm olun gedin.




– Qadan alım, xanım, mənim bu ağrıyan dişimi çək.
– Sənin dişin salamatdır.
– Salamat olsa da çək, diş nədir ki, canım da sənə qurbandı.

Nuxada gimnazistlər şəhər bağında.

Въ Нухе гимназисты въ городскомъ саду.



Millətpərəst student: Müsəlman qardaşlar! Mənim gecə-gündüz fikrim budur ki, təhsili qurtarıb başlayım millətimə qulluq eləyim, bəlkə bizim yazıq millət də gözünü aça...

– Biz zalım deyilik, zalım millətimizdir. Əgər millətimizin yüzdən biri qəzet oxusa, Qafqazda yarım milyon müştərimiz olardı, onda biz də əmələyə nə qədər məvacib istəsəydilər verə bilərdik.

– A millət, siz nə zalımsınız, niyə qəzet oxumursunuz?

– Biz zalım deyilik, bizim savadımız yoxdur ki, qəzet oxuyaq!!!

– Bəs niyə uşaqlıqda məktəbə getmədiz ki, savadsız olduz?

– Getmişik, hamımız uşaqlıqda məktəbə getmişik və beş-altı il də «əlif zəbər ə» demişik, bununla belə indi genə çox zad bilmirik.

– Bəs niyə özgə millətlərin uşaqlarının hansı biri üç gün məktəblərinə gedirsə, öz dilində hər cür yazmaq-oxumaq bilir?

– Onların öz dilinə görə asanca əlifbaları var. Məktəbə getməmiş elə evdə də öz-özündən hərfləri tanıyırlar. Zalım bizim əlifbamızdır!!!

Doğrudan belədir! Vallah belədir! Billah belədir! Qəzetələr yeriməyir camaatın savadsız olmağına görə, camaat savadsızdır əlifbamızın pisliyinə görə!!!

Məni dünyada bir şey çox yandırır, məsələn, üləmaya söz demək olmaz və demirik də. Çünki vərəseyi-ənbiyadırlar. Seyidə söz demək olmaz! Zaçem? Çünki əksəri övladi-peyğəmbərdirlər. Falçıya, cindara söz demək olmaz. Çünki müsəlmanıq, etiqadımızda cin var. Bircə bilmirəm bu ərəb əlifbası nədir ki, tuği-lənət olub keçib boğazımıza? Niyə cəsarət edib onun boynunun ardından vurub salmırıq eşiyə?! A canım, genə dualar üçün, ərəb yazıları üçün, şəriət üçün ərəb əlifbası olsun da, axır belə bizim bu öz türk dilcigimizə yarayan bir əlifba düzəltsək, yəni qiyamət qopar? Qafqazdan sənə yüz min bisavad müsəlman göstərim ki, nə məktəb görməyib və nə işqol, amma tamam meygədanların və restoranların qapısında vıveskaların və içərisində stulların nömrələrin oxuyurlar və bir yerə məktub göndərəndə də paketin üstün də özləri yazırlar. Rus qəzetələrinin hürufatın da oxuyurlar. İntəhası dilini başa düşmürlər. Nə olar yəni biz də öz dilimiz üçün bir elə asan və hər səslərimizə görə bir hərfi olan əlifba düzəldək? Onda ərəblər gəlib bizi Qafqazdan qovarlarmı? Yainki bir günahi-kəbir etmiş olarıq? Görəsən təzə müəllimlərimiz o qədər kordurlar ki, bu böyüklükdə nöqsanı görmürlər? Əgər görürlər, bəs niyə dinmirlər? Hər kəs mərc gəlir gəlsin, bu gün siz mənə öz türk dilimizə yarayan mükəmməl bir əlifba verin, on ildən sora mən sizə tək Qafqazdan yarım milyon qəzetə müştərisi verim, hə! Gör hünərin var, gəl mərc eləyək. Onda bilərsiniz ki, müsəlman qəzetlərinin bağlanmağına səbəb nə əmələdir, nə qəzetəçidir, nə camaat. Qarı nənənin buz üstündən yıxılmağına səbəb pişikdir, qəzetələrin bağlanmağına da səbəb əlifba!

Di gəl, büz dodağını, nə qədər güləcəksən gül!!!

*Çoban*

## TAPMACA

Tap görüm hansı vilayətdir o
Ki, səri-karə qonanlar çağadır?
Mədəni-cəhlü cəhalətdir o,
Xanı, mollası ilan-qurbağadır.
Adı məşrutə, fəqət istibdad,
Hakimi, amiri yeksər cəllad.

---

## AŞQABAD XƏBƏRLƏRİ

1) Aşqabad konsulxanasının xidmətkarlarından birisi rusca heç bir hərif də bilməyir, amma gah-gah başına kakardalı çinovnik furajkası da qoyur. Bundan xəbər alırlar ki, «ərbab, in çe fırıldaqəst»?* Deyir:

– Hala dər İran məşrutə şode, hər çe mixahi bekon, hər çe mixahi bepuş, hər çe mixahi bexor.** Kim kimədir baba, işin gör!

---

2) Aşqabadda bu il istinin hərarəti 60 qradusdan artıqdır. Şiddəti-hərarətdən Molla Müseyyib dəstəsi qaranlıq gecələrdə özlərini verirlər qaradskoy bağdakı daşdan tikilən mağaranın içinə.

---

## TƏBRİZ XƏBƏRLƏRİ

Allah lənət eləmiş Nəşri-maarif cəmiyyətinin tərtib verdiyi təzə millət bağçasında camaat gəlib həm gərdiş edib, həm də ruznaməcat oxuyub yoldan çıxıb laməzhəb və bidin olurdular. Və bəzi vaxtlarda məmləkətin və millətin tərəqqisi xüsusunda bəzi namünasib nitqlər də irad olunurdu. Biçarə camaatı dəvət edirdilər təzə icad olunan pis-pis işlərə. Allah o xarabanı heç müsəlman qardaşa göstərməsin və mən də görməmişəm. Və həmişə oranın bağlı qalmış qapısının qabağından keçəndə əbamı çəkərəm başıma və gözlərimi bərk-bərk yumub bir təsbeh lənət Cəmiyyəti-nəşri-maarifə oxuyub, keçərəm ki, gözüm sataşmasın! Vəli, eşitdiyimə görə əzqərari-təqrirati-cənabi-müstətabi-şəriətmədar ağayi-Axund Molla Həmzə Xiyabani guya, belə rəvayət edirlər ki, Nəşri-maarifin bəzi üzvləri də əraminədəndir. Müsəlmanlar ilə əl-ələ verib və xəyali-namübarəkləri də bu yerdədir ki, camaatı yoldan çıxardıb laməzhəb edələr. Hətta yetim uşaqlar və bisavad adamlar üçün həmən bağçada neçə klasdan ibarət bir məccani məktəb də tərtib verib.

---

*Tərcüməsi: Ağa, bu nə fırıldaqdır. *(Red. – T.K.)*

**Tərcüməsi: İndi İranda məşrutə olub hər nə istəyirsən elə, hər nə istəyirsən gey, nə istəyirsən ye. *(Red. – T.K.)*

Əncüməni-müqəddəsimizdə oturub millət qəmi çəkən ağaların Allah ömri-şəriflərin uzun eləsin, çünki bu vücudi-mübarəklər heç vaxt razı olmayıblar millətin zəhmət çəkib, elm əxz edib, tərəqqi tapıb laməzhəb və bidin olmaqlarına. Bu xüsusda Əncüməni-əyalətidə neçə dəfə xüsusi məclislər təşkil olundu. Axırüləmr rəy verildi ki, bağça bağlansın. Və əksəriyyəti ara ilə ağayi-Axund Molla Həmzə cənabların intixab edib rəvanə elədilər Əyaləti hüzuruna ki, bu xüsusda protest olunsun və Əyaləti də məhz Molla Həmzə cənablarının qəlbi-mübarəkləri sıxılmasın deyə əmr buyurdular ki, əcalətən axşamçağı həmişə maarif bağçası bağlansın. Və ümid bunadır ki, bu gün bəd əzqürubi-afitab bağlansın hökmü çıxdı. İnşallah-taala tezlik ilə bir əlahiddə hökm sadir olar ki, Təbrizə nəşri-maarif lazım deyil.

*İmza: Molla Zuri*

---

## TELEQRAF XƏBƏRLƏRİ

Batum - İrəvanlı bir məşədi qabaqdan orucluq gəldiyinə, and içdi ki, hələliyə yalan danışmasın.

---

Naxçıvan – Orucluğa 13 gün qalmış «Çakər» «Molla Dadını» duelə çağırmışdı. «Çakər» tərəfindən duelə nəzarət edən «Mirəbdülhüseyn ağa» ilə «Keçəl Qasım» idilər. «Molla Dadı» tərəfində isə «Kor Kazım» ilə «Ağzıcırıq Nağı» təyin olunmuşdular. Duel gündüz saat onda məscidi-came həyətində vaqe oldu. «Molla Dadı» ağır surətdə yaralanıb xəstəxanaya aparıldı. «Çakər» salamətdir.

---

Tehran – Darvazeyi-dövlətdə Sipehdarın parkının yanında bir yalan mədəni tapılıb. Keçən gün oranın imtiyazı Sipehdar və Sərdar Mansur və Məəzüssultana verildi. Onlar da mədənin rəvacı üçün «İttihad-sülasə» adlı bir mötəbər kompaniya tərtib ediblər. Hər kəs mədənə şərik olmaq istəsə «Tovşantəpə» xiyabanında Sərdar Mansura və ya Nasirülislam mənzilinə rücu eləsin. «Şimran» yaylağında isə «Çaleyi-hərzə»də Sipehdarı görə bilər. Kompaniyanın gələcəyi çox tərəqqidədir. Nəcəfdən, Kərbəladan çox iştirak etmək istəyənlər var.

---

Rəşt – İdareyi-ədliyyə və bələdiyyədə əbədən rüşvət yemirlər, hətta şikayətə gələnlərə müftə çay, qəlyan verirlər və çox vaxt işlərin artıqlığından biçarə rəislər çox şikayətlərə öz mənzillərində baxırlar.

---

## MAZURKA

Qaşıq çömçədən böyük olubdur. Doğrudan da dədələr sözüdür. Çox da doğrudur. Məlum ola ki, Nuxa uyezd naçalnikinin dilmancı Abbasəli bəy Mahmudov cənabları xudsəranə, küstaxanə, yəni heç bir üləma, füzəla, üdəba, üqəla və hükəma ilə məsləhət eləməyib seylabdan zərər görənlər üçün pul yığmağa şüru edib. İki saatın ərzi-tulinində siyahı üzrə və hər kəsin imzası təhtində yüz manat pul cəm edib və bu cəm olunan ianəyə yüz put un tədarük edib afətzədələrə göndərib. Çox yaxşı, çox gözəl!. Bircə bunu deyən yoxdur ki, a Mirzə Abbasəli bəy, sənin nə işin var, belə işlərə qarışıb özünü babala soxursan, özgəni də günaha?

Sən də başqa inteligentlər kimi iç soyuq pivəni, oyna vertuşkanı, ürəyin sıxılanda da al mandalinanı, çal mazurkanı, elə valisirovkanı, ol bir abrozovannı. Niyə incidirsən əmələyi-mövtanı, sındırırsan firqeyi-müsəlmanı, güldürürsən Don Juanı? Ay canım, gözüm, hətta ki, mən özüm istəyirəm yazım, qurtardı sözüm.

*İmza: Tuğ gəzdirən Qaqqılı*

***Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə***



## ÜSULİ-TƏBİİ «QİRAƏTİ-FARSİ»

Gəncə mədrəsə müəllimlərindən Mirzə Abbaszadənin mübtədilər üçün yazdığı «Qiraəti-farsi» adlı fars kitabı çapdan çıxdı. Qiyməti 12 qəpikdir. Adres:

Елисоветполь, книжный магазинъ «Медресе».








Konsulların yaylaqda məşğuliyyəti.

## ƏDƏBİYAT
## İRANLIDIR

Hər məkanda görsəniz bir biqərar, iranlıdır,
Qürbət eldə sinəçakü dağdar iranlıdır,
Həsrəti-əhlü əyalü intizar iranlıdır,
Amirə, məmurə, fərraşə düçar iranlıdır,
Naibə, xanə, əmirə mərdəkar iranlıdır.

---

Zülmə tab etməkdə bu qövmün yədi-tulası var,
Hər cəfa ilə əyilməz qaməti-balası var,
Keyfini pozmaz, onun tiryakı var, hoqqası var.
Rahətü məstü xərabü xarü zar iranlıdır
Hər məkanda görsəniz bir biqərar, iranlıdır.

---

Gah hürriyyətçidir, çünki buna möhtacdır,
Canfəda, Səttarü Yefrem başlarında tacdır,
Qəhbə istibdad əlində gahi də «qırmac»dır.
Gündə bir rəngə düşən bietibar iranlıdır
Bivəfalıqda cahana aşikar iranlıdır.

---

Qaldıran Səttarı min izzətlə gahi başına,
Gah Sipehdarı çəkən yüz naz ilə ağuşuna,
Gah çəkib tiği-xüsumət canfəda qardaşına.
Qəhrəmanın tapdadan binəngü ar iranlıdır,
Mollası, şahı, vəziri hiyləkar iranlıdır.

---

Öldürən bunlar, ölən bunlar, yanan bunlardılar,
Odluyan bunlar deyildir, odlanan bunlardılar,
Xainə, şeytana hərdəm tovlanan bunlardılar.
Alimi-cahilfəribü fitnəkar iranlıdır,
Sahibi-əqlü təmkinü vüqar iranlıdır.

---

Həqq yaratmış baş-qulaqlı, bir cürə insandılar,
Guyiya İranda bunlar «gəlmə», ya mehmandılar,
Şiri-püstani-vətən boldur, fəqət ətşandılar.
Özgələr sirab o püstandan, kənar iranlıdır,
Öz evində görsəniz bir dilfikar, iranlıdır.



Anlamaz nəfü zərər, ya kimdi düşmən, kimdi dost,
Fəxr ilə baş qovzamaz, daim xəcalət sərfürust,
Əski dövr, əski idarə, əski adəm üstəüst.
Halı mazidən acı, çün zəhrimar iranlıdır,
Məsləkində, həm sözündə payidar iranlıdır,
Aləmi-islamə cayi-iftixar iranlıdır,
Layiqi-dünya deyil, gurü məzar iranlıdır.

*Kefsiz*

---

## ORENBURQ XƏBƏRLƏRİ

Bir neçə həftədən bəri, xəstələnmiş Orenburq milyonerlərindən Mahmud bəy və ya Həmid bəy Ufadan gəlmiş müftiyi-islamı çağırıb, keçmişdə və gələcəkdə elədiyi günahlarının fəqir-füqəraya öz prikaşşiklərinə etdiyi zülmlərdən əfv etdirib, bir çox induljanslar və «cənnət propusku»ları alıb, böylə bir vəsiyyətnamə yazmağa əmr vermiş.

Belə mühüm bir iş meydana qoymaq üçün hər cür günahlardan təmizlənməyi «Din və məişət» ərbabına həvalə olunduğundan baş mühərrir Feyzi xan əfəndi ilə bərabər Orenburq və Qarğalı mollaları «din», həm də «para» xatiri üçün bütün iş-güclərini buraxıb, Həmid bəyin Dekadans restoranlarında zəkatı təmizlənmiş «halal» malını, cənnətə sualsız girəcək xalis müsəlmanlar faydasına xərc etmək üçün bu surətdə bir «vəsiyyətnamə» düzəltməkdədirlər.

1) İnsanları zəlalətə salan üsuli-cədid məktəblərini qapatmaq üçün yüz min manat təyin olunacaq.

2) İki yüz min manat qiymətində olan «Tifkiliyev» nam xutor Qarğalı və Orenburqda mövcud müsəlmanları behiştlik edəcək dini mədrəsələrə vəqf olunacaq.

3) Üç-dörd arvadlı imanı düz mollalara və işanlara iki min manat veriləcək.

4) Musabəyov və onun məsləkində olan imansız mühərrir qəzetəçilər və üsuli-cədidə müəllimlərinin əleyhinə çalışmaq üçün müqəddəs «Din və məişət» jurnalını davam etdirib onun «mühərrirlərini» bəsləmək üçün iyirmi min manat təyin olunacaq.

5) Həmid bəyin ruhu «Apulla» və «Arkadiya» behiştinin bağçalarında hurilər və qılmanlar ilə istirahət etmək üçün Məkkə və Mədinəyə gedib Həcc qılmağa Feyzixan əfəndiyə on min manat veriləcək.

6) Tatarca teatr oyununu məhv etmək yolunda on min manat xərclənəcək.

7) Həmid bəyin yazıxanasında nə cümə və nə bazar gününü tətil etməyib, gündə on iki saat işləyib cürbəcür həqarət görən müsəlman kantorşiklərinə, Qurban bayramında iki girvənkə qurban əti ilə bir çert çay hədiyyə olunacaq.

8) Həmid bəy vəfat eləyib dəfn olunduqdan sora qırxıncı günü iki yüz mollaya qonaqlıq verilib dua olunacaq.

---

Hərgah bu vəsiyyətnamə tamamilə icra olunarsa, müsəlmanlar çox xoşbəxt olacaqlar.

## AŞQABAD

Daşt dər dəst-yeki dəstkeşe sade ze ecir,
Əlhəq insafo-təvan qoft hərirəst hərir.*

---

Dünən «Moderna» teatrının qabağında Paris modası ilə geyinib, pürqiymət brilyantlara bəzənmiş bir madmazel əlində nazik sadə əlcək, sağ əlində dəxi bir nazik təlimi, ayaqlarında dikdaban çəkmə, üzündə ağ, zərif tor, torun üstündə qara-qara xallar; qərəz, madmazel bir qəribə halət ilə yeriyirdi. Teatrın qabağında gəzən müsəlmanların hamısı xeyir-dua verməkdə idilər. Lakin biçarə usta Cəfər özün saxlaşdıra bilməyib başladı madmazelin dalınca getməyə və hündürdən bu sözləri oxumağa:

«O xal nə xaldır ora düzdürmüsən?!
De, görüm, nə xaldır ora düzdürmüsən?!.»

Madmazel acıqlanıb qaradovoy çağırıb usta Cəfəri göndərdi polisəyə. Madmazel deyir ki, bu mənə «naxal, naxal» deyib dalımca söyə-söyə gəlirdi. Xahiş edirəm protokol yazıb suda verəsiniz. Usta Cəfər nə qədər atasının ərvahına and içdi ki, mən ona istədiyimdən «nə xal» demişəm, sözü qəbul olunmadı. Usta Cəfəri göndərdilər türməyə, işi də yolladılar sudyaya. İmdisə usta Cəfərə bir dava vəkili lazımdır ki, «nə xal» ilə «naxal» sözünü tərcih elətdirsin. Eşitdiyimə görə madmazelin buxağında bir, yanağında dəxi bir xal vardır. Burada məsələ bir az çatallaşır. Allah usta Cəfərə kömək eləsin.

*Naxçıvandakı Cüvəllağının dostu*
*Aşqabaddakı Xortdan bəy*

---

## QAFQAZ XƏBƏRLƏRİ

İran şahı Əhməd şahın təvəllüd bayramın bu il konsulxana əmәlləri Qocurda çox təntənəli surətdə bərpa elədilər. Muzıka olmadığı üçün məclisi zurnaçılar ilə müzəyyən eləmişdilər. Bu da məlumdur ki, Ləzgi, Şalaxo və Uzundərə havaların zurna-balabanla yaxşı oynamaq olur. Hər kəs bu dəfə konsulxananın qoca və cavan xanlarının Ləzgi və Uzundərə oynamaqların görsəydi, bu millətin cibilli və fitri istedadına heyran qalardı ki, az bir zamanda bu havaları elə yaxşı öyrənib oynayırdılar ki, bunların ətrafına tamaşaya cəm olan yüzlər ilə çoluq-çocuq fit çalıb əl vurmaqdan özlərini saxlaya bilmirlərdi.

---

Tiflis – neçə gün bundan qabaq Şeytanbazara Naxçıvandan bir vaqon qumarbazlar varid oldu. İçlərində olan bir nəfər Kutais gimnaziyasının şagirdlərində .......... oğlunu başmaqlı uddular. Təhsilə gedən bu binəvanın yol xərci qalmadığından genə yoldaşları himmət edib hərəsi on manat-on manat verib dünən təntənəli surətdə yola saldılar. Afərin naxçıvanlılara və Naxçıvan qumarbazlarına!!!

*Tərcüməsi: Əlində maral dərisindən sadə bir əlcək var idi; İnsafla desək, doğrudan da ipək kimi idi. *(Red. – T.K.)*

Молочная и кофейная въ Батуме.




Batum intelligentlərinin qəzetə həvəsləri. Moloçnı dükanında.




– Ay qardaş, bunlar niyə savaşır?
– Orucun kefi gəlib!
– Vah, znavakon mən  bir tüngi çaxır içdim heç savaşmadım, oruc çaxırdan güclüdür.

Avqustun axırları




– Baron Tiqran, oğlunu gimnaziyaya qəbul elədilərmi?
– Vah, necə qəbul etməzlər ki, hamı atmetkaları beş idi.

Ramazanın əvvələri



– A Kərbəlayı, bildinmi oruc nə gündən hesab oldu?
– Balam, keçən ayın kəmyeki var imiş.
– Oğlun da oruc tuturmu?
– Bay, niyə ki, tutmaz? Yeddi yaşı tamamdır da!..

***

Naxçıvan – bizə yazırlar ki, neçə gün bundan irəli, şəhər bulvarında «maarifpərvər» cavanlardan bir neçəsi bir nəfər Tiflisdən gəlmə «pansion» saxlayan müəllimənin uşaqlara dərs verməyi və onun bacısının uşaqları yanına salıb bazarda, bağda tərbiyə öyrətməyi barəsində söhbət etdikləri əsnada aralarına mübahisə düşüb, iş davaya müncər oldu.

Yumruq, şapalaq və ağac şaqqıltısından bulvarda gəzən əcnəbi xanımları və kişiləri hamısı qaçıb evlərində gizləndilər.

Polisə yetişib əhvalatı təhqiq etməkdən ötrü cavanları araşdırıb faytonla polisəyə apardılar. Çünki .......... yerdə yeriməyə bir az ........ taqətləri yox idi (maşallah, arifsən, anlarsan!).

Bakı – Bakı konsulunun üç aydan sora müddəti-xidməti tamam olduğundan və öz vətəninə aparacağı üç yüz min manatın «əlli min» manatı kəsir olduğuna və bu əlli min manatın İran təbəələrindən şapalaq, kötək, həbs ilə çıxmadığından konsul cənabları təcili teleqraf vasitəsilə konsulxana üçün Marokkodan 12 «Mirqəzəb» istəyib. Şəhər həyəcandadır.

---

## GÖYDƏ AYNA

Ərəszadə Qafqazda olan böyük üləmaları adbaad zikr edib bir «əhəmiyyətli məsələ»dən ötrü meydani-mübarizəyə dəvət eləyir.

Allah başınıza daş salsın: min ildən bəri belə «əhəmiyyətli məsələ»lərə məşğul olub, iki yüz milyon məxluqun evin yıxdız, heyvan eləyib çöllərə saldız, genə yaxalarından əl çəkmirsiniz?!

Hələ qəzetələrimiz də belə «əhəmiyyətli məsələ»lərə yer verir.

*Qızdırmalı*

---

## ELAN

Yazıb hamı müsəlman qardaşlara məlum edirik ki, bir neçə nəfər aşağıda qol qoyanlar, bisavad müsəlmanların halına ürəyimiz yanıb, iki sətirlik bir ərizə yazdırmaq üçün özgə qapısına getməsin deyib, bu günlərdə yığılıb bir şirkət düzəltdik ki, bundan böylə hər cür ali divanxanalara və məhkəmələrə lazım olan ərizələr yazmağa qadirdir. Ərizə qiymətləri çox ucuzdur. Səhər ertə gələnlər ciblərində bir turş zakuska ilə gəlsələr dəxi də gözəl olar. Özgə şəhərlərdən də zakaz qəbul olunur. Nümunə üçün bizim yanımıza gələnlərin məmnun qalmaları şübhəsizdir.

Adres: Naxçıvan, Ambarsumun dükanının küncündə və şöbəsi Nersesin balkonunda.

*İki nəfər kefli bəy ilə bir nəfər tiryaki bəy*

## YUXU

Molla əmi! Cənabınızdan təvəqqe edirəm mənim bu yuxumu təbir edəsiniz. Axşam evdə bozbaşı o qədər çox yedim ki, otura bilməyib yatdım və vaqeə gördüm.

Gördüm ki, saqqalına qurban olduğum bizim Hacı İsa əfəndi evi tikdirib qurtarıb. Bircə suvağı qalıb. Suvaqdan ötrü samana müntəzirdir ki, camaat gətirəcək. Bir qədər gözləyir, gətirən olmur. Axirüləmr, əfəndi öz mollalarından bir nəfərini yanına salıb çıxır kəndin kənarında olan xırmanlardan saman dilənməyə. Allah rast salır ki, yolda sahibsiz və heyvansız bir ərəbəyə təsadüf edir. Əfəndi ərəbəni görcək bir tərəfindən özü və digər tərəfindən mollası çəkə-çəkə aparırlar xırmanların yanına və hər xırmandan bir qədər saman istəyib, alıb ərəbəni tamam doldurandan sora gücləri gətirməyə çatmır. Bu halda əfəndi bir dua eləyir və iki dəqiqə keçməmiş «Xızr» yanlarında hazır olur (Xızr yavıqda işləyən bir fəhlədir) və bunlara kömək edib ərəbəni gətirirlər lap əfəndinin evinə. Sora Xızr gözdən qeyb olur. İndi əfəndi haman Xızrdan nə qədər axtarırsa, daha tapmır, çünki Xızr əfəndiyə lazımdır ki, müftə işləsin. Sora əfəndi məcbur olur ki, pul ilə fəhlə tutub evi suvatdırsın.

---

İndi hər kəs mənim bu yuxumu təbir eləsə dostum olan Hacı Bəkir əfəndidən təvəqqe edərəm behiştin açarlarından bir dənəsin haman adama bağışlar. Bu şərt ilə ki haman adam nə eləsə eybi yoxdur, ancaq həmişə namaz qılsın.

---

## TAZİYANƏ

Mali-dünyayə kişi bənd olmaz,
Maili-cifə xirədmənd olmaz.
Dedi minbərdə bu gün Molla Namaz:
Nari-Cənnət belə peyvənd olmaz.
Cahili-sırf müsəlman bəndə
İki dünyada da xürsənd olmaz.
İstə ya Cənnəti, ya Ərafı,
Həm Buxara, həmi Xokənd olmaz.
Nədi bir bunca həvəs, hirs, tamah,
«Sənə bundan da gözəl pənd olmaz».
Mən «bəyəndim» sözünü mollanın,
Xəlqi soymağa belə fənd olmaz.

*Kefsiz*

---

## BU GÜN

Bu gün Təbrizin Topxana meydanında dar ağacları tikildi. «Həcamət» sözü ağzına gətirəni dara çəkəcəklər, çünki «Əmirə» dəxli var. Və bir də pul, ev əsbabı, at, tüfəng sözü danışanın ayaqlarından dara çəkəcəklər; çünki Urmi, Xoy, Səlmas və Qaradağın «əmirə» təəllüqi var (əmir haman Əmiri-Həcamətdir).

---

Bu gün ümumi-övliyayi-millət cəm olub bir ali məclis qurub müzakirə edirlər ki, neçə il bundan irəli Təbriz mütriblərinin həmqatarları olanlara böyük işlər və qulluqlar versinlər. Bu surətdə gərək mütrüblərə də uca mərtəbə təyin olunsun ki, onların qəlbi sınmasın. Yuxarıda zikr olunan adamların çoxu İran inqilabında gözümüzün qabağında Rusiyada gəzib kefə məşğul ididər. Amma biçarə mütriblər mücahidlərin səngərlərində gecə-gündüz güllə qabağında çalıb-oynayırdılar. Heç insaf deyil ki, bu yazıqlar bikar qalsınlar.

*İmza: Gələn-gedən*

---

## SÖHBƏT

– Cənab! Ağa! Hara buyurursunuz?
– Meydanda ictimai-müslimin olan dükana.

---

– Cənab H.Ə. əfəndi! Bu istidə hara zəhmət çəkirsiniz, xeyirdirmi?

– İnşallah ki, xeyir olar. Aşağa Hacı dayının dükanına gedirəm, görüm təzə xəbər varmı?

– Bəs siz hara gedirsiniz?

– Balam, bazarın yuxarısında oturmağa dükan tapmıram. Adamlar hamı xarab olublar. Gedirəm aşağa meydana tərəf. Genə babat adam Ağdaşda bir Hacı qalıb.

– Bəs, ay əfəndi, sən hara gedirsən, bir-iki saya-saya?

– Gedirəm Hacı dayının dükanına, əfəndilər cümləsi orada mənə müntəzirdirlər. Tas qurub Molla Nəsrəddinə xəbər yazan adamı tapıb sora boğacağıq.

## TEHRAN XƏBƏRLƏRİ

Bu gün şaban ayının yeddinci günü məclisi-millidə 5 nəfər üləmanı Şeyx Fəzlullah təqdim etdiyi qanuni-əsasinin mövcibincə intixab etdilər.

1) Hacı Mirzə Zeynalabdin Qumi.
2) Seyid Əbülhəsən İsfahani.
3) Hacı Mirzə Seyid Əli Hairi
4) Ağa Seyid Həsən Müdərrisi-Qəmşeyi
5) İmami-Cümə Xoyi

Allah mübarək eləsin! İndi soruşsanız ki, bəs niyə beş nəfər təyin olundu, artıq-əskik olmadı? – Əlbəttə bunun cavabı məlumdur: çünki əllərin və ayaqların barmaqları beşdir. Genə desəniz ki, barmaqlar nə üçün beş dənə xəlq olunub? Cavab odur ki, Məclisi mərhum «Mücavirül-ənvar» kitabında yazdı ki, «pənctəni-ali əba» beş nəfərdirlər. Xülasə, nə yaxşı deyib Xacə Hafiz:

«Səngini bədəni-xodra bər payi-çəp əndazəd».*

*İmza: Dılğır*

*Tərcüməsi: Ağır (adam) öz bədəninin (ağırlığını) sol ayağının üstünə salar. *(Red. – T.K.)*

## TƏZƏ XƏBƏR

Dünyada «Erlix» adında bir professor neçə il zəhmətdən sora firəngi luis naxoşluğunun əlacını tapıbdır. Erlix tapdığı «606» nömrəli bir davadır ki, onu bir dəfə naxoş adamın dərisi altına buraxanda haman adam fövrən şəfa tapıb, bu zamanadək dərmanı tapılmayan dərd ondan rədd olur. Hal-hazırda cəmi qəzetlər bu barədə məqalələr ilə doludur və Erlixi təbrik etməkdədirlər.

Bunun müqabilində Aşqabad şəhərində usta Xoruzullah adında bir dəllək zökəm naxoşluğunun əlacını heç axtarmamış tapıbdır. Hər kəs zökəm olsa, gedib Atakişi bəyin pak hamamında ki, məxsusi arx suyu ilə işləyir, isti suda çimsin və çiməndən sora girvənkə yarım qara turşu yeyib uzansın. Məzkur naxoş o saat rahat olar.

*İmza: Seyid Nəcəf Bina*

---

## POLİTİKA İŞLƏRİ

Rəşt – Səhih xəbərlərə görə Şəriətmədar Sipehdara teleqraf edib soruşub ki, sənin altmış üç yaşın var, altmış iki il yarım müstəbidi nömreyi-əvvəli-İran idin. Baş kəsib qarın yırtırdın və yüz minlərlə rüşvət yeməkdə məşhur idin. Xahiş edirəm mərd-mərdanə, xəlvətcə mənə yaz görüm, sən nə sehr elədin ki, beş ayda tamam İran səni məşrutəpərəst hesab edir?

Cavabın da müfəssəl teleqraf edib. Müxtəsər məzmunu budur ki: «İran məmləkətində belə işlər çox olar, xam olma. Çünki tamam işlər sözdür, əsli yoxdur. Əgər qurddan çoban olar isə, İran ricali-dövlətindən də məşrutəçi olar. Bizlər hamımız dəstpərvərdeyi-Mirzə Ələsgər xanız. Hər gün altmış cildə girərik və bir milyon yalan danışarıq. İnanan axmaqdır, bizlərdə taxsır yoxdur.»

---

**«Molla Nəsrəddin»in 32-ci nömrəsindəki tapmacaya cavab**:
**Şahları mamlımatan, Sərdarları qatırsatan,**
**Salarları kərpic atan, Di gülüm İran nay-nay.**

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*

16 rəməzan 1328 **Beşimci il** 8 сентября 1910 г.

# ملا نصر الدين

№34 Qiymәti 12 qәpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 k. № 34




Litoq. S.Bıxova

Vay bizim halımıza! Şeyxülislam da qızlarını «Svyataya Nina» məktəbinə imtahana gətirib. Evimiz yıxıldı! Din əldən getdi!..

## ƏDƏBİYYAT

### İKİ SƏS

Nədir, ah, ah, bilməm genə bu sədayi-dilkeş,
Bu nəvayi-dilxəraşü o səmai sövti-sərkəş,
Bu inilti, bu sızıltı, bu qiyafəti-müşəvvəş,
O büsati, dilgüşai, səri-xaneyi-münəqqəş,
Bu nə cangüdaz səsdir eşidənlər eyləyir qəşş?!
O büsat içində hazır bütün eyş, pak, biqəş?!

O həzinü ac kimdir?!
Belə xoşməzac kimdir?!

Düzülüb süfufi-mehman, gediyor şətarət ilə,
Geyinibdir ağ molla, yeriyir nəzakət ilə,
Tələbə, mürid, kila dalıda məharət ilə,
Neçə Hacı, kərbəlayı, məşədi təharət ilə,
Dəxi bircə dilşikəstə sürünür nə halət ilə,
Edilir hücum, yarəb, nərəyə cəmaət ilə



Bu zəlilü ac kimdir?!
O ümumə tac kimdir?!

Genə, şübhəsiz, bir evdə olunub tədarük ehsan,
Genə «dəmlənib» samavar, qurulubdu qəhvə, qəlyan,
Salınıbdı süfrə, səngər (!) çəkilib plov, fisincan,
Hamıda süruri-behcət hamı məst, şad, xəndan,
Hamı süfrəyə müqərrib, hamıda təlaşü həycan.
«Buyurun» xodu verilcək düşəcək işə dəyirman,
Füqəranı mən üçün var qapıda iki nigəhban.



Bu həzinü ac kimdir?!
O ümumə tac kimdir?!

Sənin, ay fələk, cahanda nə çəkilməz işlərin var?!
Nə duyulmayan əməllər, nə əcəb gezişlərin var?!
Neçə molla qəhrəmanın, neçə hac məmişlərin var,
Bəyə, xana, əğniyayə yeməli yemişlərin var.
Füqərayi-bipənahə məşədi qəmişlərin var,
Ona katletin, kəbabın, buna sərzənişlərin var.

Bu plov-turac kimdir?!
Di! Bu laəlac kimdir?!



*Kefsiz*

## YARITMAZ

İndi Molla Nəsrəddin nə desin? İndi Molla Nəsrəddin qaragünlü başına nə kül töksün? İndi adın da qoyacaqsan yarıtmaz. Belə bunu Molla Nəsrəddin yüz dəfə deyib ki, aşnalıq, dostluq başqadır, məslək başqa. Molla Nəsrəddin aşnalığa, dostluğa, tərəfgirliyə, təvəkkül Allaha, qoy deyim, hətta pu... pu... pu... pu... pula da məslək satmaz (zalım pulu demək də olmur).

Yaxşı, tutaq ki, Molla Nəsrəddin durdu osmanlı dilini təriflədi, onda ona deməzlərmi: «A çalsaqqal! Bəs bu neçə ildən bəri osmanlı dilinin tənqidilə baş-qulağımızı niyə dəng eləmişdin? Onda yazıq molla nə cavab versin? Ya desə ki, «Osmanlılarda dil varmı?» məqaləsin yazan osmanlıya düşməndir, çünki onları belə vaxtda tənqid eləyib, onda ona nə deyərlər? Deməzlərmi: «Ay utanmaz kişi! Onda Osmanlının, İranın, bəlkə ümumi müsəlmanların əvvəlinci düşməni sənsən, çünki işin-gücün gecə-gündüz onları tənqid etməkdir».

Yox, yox, aşna, deyəsən bu dəfə işdə bir aa... a azzz... əngəl vaarrrr. İndi sən bilirsən nə elə? (O, adama cavab verməyə tənəzzül etməməkdə özümü haqlı görürəm) Sözün üstündə möhkəm dur.

O adam nə eləsin? O da (bundan sora daha cavab bəkləmə) sözünün üstündə bərk-bərk dayansın, qalmaqal qurtarsın getsin. Qaldı ki, təmtəraq, doğrudan da ərəb və fars dilinin təmtərağı başqadır. Bir bu şeri oxu:

Çün qərəz aməd hünər puşidə şod
Səd hecab əz-dil bəsuyi didə şod.*

*Qızdırmalı*

---

## GÜLÜŞMƏ

*(Molla və mürid)*

Molla – Eşidibsənmi balam! Tazə xəbər?
–Nə, axunda nə olubdur ki, məgər?
–Gözün aydın ki, qəzetlər qapanıb!
–Mən ölüm?! Hankısı, hankı qapanıb?
–Bağlanıbdır «Həqiqət» və «Səda».
–Həmdülillah! İkisi ha, xa, xa, xa,
–Di, sevindirməmi ver! Şad oldun.
–De ki, qəm-qüssədən azad oldun.
Mürid – Ax, nə Allah tərəfi oldu bu iş!
–Çox olar, qəlbini sən saxla geniş!
–Nə səbəb oldu ki, bağlandı bular?
–Baisi oldu «zabastovkaçılar»...
–Qanmıram, söylə «zabastovka» nədi?
–Yəni işçiləri tətil elədi.
–Elə tətil ilə tətil olunub?
–Bəli, tətil ilə təlil olunub.
(Məyusanə) Elə bildim ki, hökumət qapayıb.
Dadı yox indi ki, millət qapayıb.
Ax! Bu qəzetlərlə necə heyfim var?!
Gər hökumət qapaya keyfim var.

*Məşədi Sijimqulu*

*Tərcüməsi: Çərəz gəldiyindən hünərin (üzü) örtüldü, ürəkdən yüz hicab tərəf gəldi. *(Red. – T.K.)*

## TEHRAN XƏBƏRLƏRİ

Təzə vüzəra kabinəsi «Xəli-əsləhə» qanunun icra və ümumi rahatlığı bərpa etmək üçün, Məclisi-millidən üç aylıq ixtiyarat təhsil edəndən sora neçə dəfə nəsihətlər ilə qoçulara (mücahidlərə) silah götürməməyi təklif etdilərsə də, onlar Mirzə Əbülhüseyn xan, Müizzüssultan və sair dəstələrin təhriki və bəngdar Hacı Məhəmmədtağıların təşviqi və bəzi etidaliyyununköməkliyi ilə məclisin və vüzəranın hökmünə rəğmən elani-hərb etdilər. Şabanın əvvəlində toqquşma vaqe oldu. Qoçular Səttar xan və Bağır xanın mənzilində cəm olub bir dövləti-müstəqilə düzəltdilər. Amma bu dövlət bir neçə saatdan artıq davam edə bilməyib, əlli nəfər tələfat verəndən sora basıldılar.

Sərdar Bahadır və Müsyö Yefrem bu ayın ikinci gecəsi qürubdan üç-dörd saat keçmiş qəhrü qələbə ilə parki-Ətabəgə varid olub baqi qalan qoçuları əsir və dəstgir eləyib nəzmiyyə dustaqxanasına göndərdilər. Parkın bir guşəsində spiçka işığı ilə Bağır xan cənabların tapıb ona yaxınlaşanda, uzaqdan səsləndi: «Müsyö Yefrem, bu nə oyundu çıxardırsınız? Mən... özüm bu....ların yaraqlarını alacaq idim, daha dava-şava lazım deyil idi ki! İndi istəyirsiniz izin verin hamı tüfəngləri alıb sizə təslim edim». Bu qəhrəmanın sözün eşidən Müsyö Yefrem yaxınlaşıb cavab verdi ki: «Daha siz zəhmət çəkməyin, əsləhələr tamam alındı. Ancaq lazımdır siz də tüfənginizi və qatarlarınızı verəsiniz». Bağır xan cavab verdi ki: «Mənim qatarlarım və tüfəngim boşdur. Bir dənə də güllə qalmayıb». Sərdar Bahadır irəli gəlib tüfəngi alıb dolu gördükdə, Molla Nəsrəddinin gözündən iraq ustanı şapatlayıb şagirdlik vaxtını yadına saldılar, tapdaya-tapdaya parkdan çıxardıb Səmsamüssəltənənin evinə göndərdilər.

Səttar xanı da bir bucaqda ayağı yaralı tapdılar. Fövrən cərrah-filan hazır edib və o biçarəni də ehtiram ilə Səmsamüssəltənənin evinə göndərdilər. Müizzüssultan və Məşədi Sadıq bu fəsadlara ətək vurandan sora qaçıb Osmanlı səfarətxanasında gizləniblər. Xülasə, indi Tehran süd gölünə düşüb. Hamı rahat və asudə vardılar. Hamıdan artıq Tehran arvadları və uşaqları qoçuların zəhmətindən xilas oldular.

*İmza: Dılğır*

---

## RƏSMİ XƏBƏRLƏR

Cənab xan! Danabaş kəndində Kərbəlayı Nəcəfəlidə mənim yeddi manat tələbim var, yaz o pulu göndərsin, göndərməsə onun özün təhtülhifz gətirdin buraya.

13-cü imam

Atam-anam sənə fəda olsun, daha nə fərman?

*Xan*

---




Aziya məktəbi.

## MOİZƏ

Ramazan ayını məşğuliyyət ilə keçirməkdən ötrü Tiflis Şeytanbazar möminləri İrandan Kəblə Ağabala adında bir vaiz gətirdiblər (adına baxanda meymun oynadana oxşayır). Cənab vaiz hər gün minbərdə ağzıoruc müsəlmanlara moizə eləyir. Keçən gün minbərdə orucu batil eləyən şeylərin hamısını birbəbir nəql elədi. Hətta «cima səhvi» adında bir hədis təfsir elədi ki, indiyə kimi eşidilməmişdi. Təfsil ilə burada yaza bilmədiyimizdən yazıb haman məclisdə təşrifi olmayan müsəlman qardaşlara məlum edirik ki, məsələlərinə arif olmaq üçün bu moizəni haman gün məsciddə olanlardan soruşsunlar. Yainki bir gecə iftara Kəblə Ağabala əminin özünü qonaq dəvət edib plovdan sora xəbər alsınlar. Amma bunu əlavə edirik ki, məsələyə qulaq asanlar üzlərinə bir örtük salsınlar ki, qızarmasınlar, çünki məsələ çox şiddətlidir...

*İmza: Minbər dibində oturan*

---

## TİCARƏT XƏBƏRLƏRİ

–Ağa Mirzə Vəli, hara gedirsən?

–Gedirəm Bakıya bir az xırıd eləməyə.

–Xırıdın nədir?

–Təzə xəbər eşitməyibsənmi? Buraya Peterburqdan Pruşkeviç tərəfindən bir adam gəlib. Bir neçə vaqon söyüş xırıd eləyəcək, bu il Dumada lazımlarıdır. İndi mən gedirəm Bakıya, Quba meydanından bol-bol söyüş xırıd eləyib gətirib satacağam Pruşkeviçin adamına. Allah kərimdir, bəlkə şahı bistnəf eliyə.

–Əcəb axmaq adamsan, daha Bakıya niyə gedirsən?

–Bəs hara gedim?

–Elə burdanca dur, düz get Şeytanbazara, soruş Hacı Ələsgər Məhəmmədovun kitab satan dükanını. Göstərsinlər, gir içəri. Əlini sal cibinə, on qəpik ver, al iki dənə Bakıdan gələn müsəlman qəzetəsi. Bakının Quba meydanının, Tiflis Şeytanbazarının söyüşləri, tamam müsəlman şəhərlərinin təkfiri, təsfiri, hamısı o qəzetələrdə. Neçə vaqon söyüş istəsən olardan cəm elə, apar sat. Sən mənfəət elə, o kişinin də karı düzəlsin.

*Əqrəb*

---

## BELƏ OLAR HA!

Dedim, a kişi, Kəblə Əli əmi, gəl sən mənə qulaq as, lənət şeytana elə, bu Xalatov karvansarasında qalma, köç get ayrı bir yerə. Canım, bu yekəlikdə Tiflisdə başına yer qəhət deyil ki!

Elə mən dedikcə sən dedin ki: bilmirsən ki, bu müsəlmanların məhəbbəti məni özgə yerə getməyə qoymur?!

Ax!.. İndi mən neyləyim? Başıma nə kül töküm? Sözümə qulaq asmadın, axırda başına o cür müsibət gəldi. Xülasə, bir səhvdir eləmisən, keçibdir. Ürəyini sıxma, ümidini bir Allaha bağla. Şükr olsun ki, bu dəfə yaxşı qurtardın. Amma bax, indidən sənə tapşırıram, yorğan-döşəkdən qalxan kimi gəl məni tap, gedək sənə özgə yerdə mənzil tapım.

*Kəblə Əli əminin dostu Kəblə Kövsər*

---

## ORUCLUQ

–A kərbəlayı, hara gedirsən?

–Orucluqdur da, bazara xırım-xırda almağa.

---

–Ay Hacı, nə çox hamama gedirsən?

–Balam, orucluqdur da, adama su lazım olur.

---

– Ay usta Fərzalı, axır ayağım yalındır, mənim başmağımı qurtar da.

–A Məşədi, orucluqdur da, iş işləmirik ki!

---

– Ağa Qulaməli, hardan gəlirsən?

– Orucluqdur da, məsciddən.

– Axund nə vəz eləyirdi?

–Orucluqdur da, cimadan və orucu batil eləyən şeylərdən.

---

–Ay Hacı, məktəbiniz niyə bağlıdır, hamı məktəblər açılıb ki?

– Orucluqdur da, qızlar evlərində oruc tuturlar.

---

–Məhəmməd Əli, uşqola niyə getmirsən?

–Orucluqdur da, qoy orucluq qurtarsın gedərəm.

---

–A Tubu xanım, əlin niyə qırmızıdır?

–Balam, orucluqdur da, ərim minbərdə vəz eləyir, gərək hər gecə saqqalına həna yaxam.

---

–A gədə Səməd, ərbabın səni niyə söyürdü?

–Orucluqdur da, papiros kefi gəlib.

---

–Ağa Mahmud, vekselini dünən nataryusda gördüm.

–Hə, balam, orucluqdur da, yatıb gündüz saat üçdə gəlmişəm, vaxt keçibdir.

*Çoban*

---

## PAPAQ OĞRUSU

Papaq, amma nə papaq!!! Onu mənə Hacı Heydər bağışlamışdı. Papaq getdi, canınız sağ olsun getdi. Bir papaqnan bizi kim tanıyacaq? Bir papaqnan qurtardıq, çox yaxşıdır. Papaq nədir ki?!

(Cahanda kəllə sağ olsun külah əskik deyil mərdə.)

Amma işin bircə əngəli var. Mən qoçaq oldum güddüm, güddüm, papağı tutdum Məzahirin keçəl başında. Sora necə olsun? Bir də mən o papağı başıma necə qoyacağam? Başım keçəl olmazmı? Yox, yox, yaxşısı budur ki, papaqdan əl çəkim.

*Başı fəsli*

---

## DÜNƏN

### ELAN

«Molla Nəsrəddin»in 31-ci nömrəsinin acığına yazıb, bu il Məkkəyə gedən Hacılara məlum edirik ki, bu gündən sizi satdıq «Rossiyski obşestvo»nun agentasına, Ciddəyə 76 manata, 4-cü klas (göyərtə). Bizə komissiya ancaq 16 manat olacaqdır. İkinci klas 115 manat, bundan da bizə çatacaqdır 25 manat, hərçənd 15 gün Sevastopolda yatacaqsınız, onun bizə dəxli yoxdur. Bundan sora ölsəniz də sizi qoymayacağıq əcnəbi paraxodu ilə getməyə.

*Altmış nəfərdən ibarət kompaniya*

Dünən getdim Nəşri-maarifə, bəh, bəh, bir qəşəng, səfalı bağçadır. Tamam bağça ağzına kimi dolu idi millət ilə. Börkləri hər biri bir arşın uzunluğunda, təpələri bir böyük tabaqca. Bir parası xiyabanlarda ağızların açıb gəzirlər, bəziləri oturub çay içirlər. Soruşdum ki, bəs burda maarifi necə nəşr eləyirlər? Cavab verdilər ki, maarifin bu camaata dəxli yoxdur, maarifi burda gizlin, məhrəmanə nəşr eləyirlər. Soruşdum, bəs, bu biçarələr elə əbəs yerə çaypulu verib gedirlər? Dedilər ki, xeyr, bunların bir məxsus işləri də vardır. Çün bura intixab fabrikasıdır, bu camaat intixab vaxtında hər biri gedib bir intixab firqəsi alıb gətirib verirlər burda lazımi olan adamlara.

*İmza: Gələn-gedən*

---

## QAFQAZ XƏBƏRLƏRİ

Batum – Biz, Batumda Alma meydanında olan iranlılar yazıb cəmi kəndlərdən Batuma alma və sair meyvə gətirib satan qardaşlarımıza məlum edirik ki, keçən gün hamımız yığılıb and içdik ki, dəxi bundan sora sizin meyvələrinizdən oğurlamayaq. Çünki on ildən bəri zəhmətlə oğurladığımız malları zəkatı, xümsü çıxılmış mallarımıza qatıb da artıq zərər gördük. Olub-qalan mayamız da əlimizdən getdi.

Qol qoydular: Batumda, Alma meydanında olan iranlılar

***

Aşqabad – Aslan bəy saqqalı vaksıladı.

---

Aşqabad – Marinski küçədə bir müsəlman evinin qapısında belə bir elan yapışdırılıbdır: Bismillahir-rəhmanir-rəhim, bənami xudayi-əzim kirayə midəhəm se otaq.* Bəndeyi-xuda Məşədi Ələkbər əhli-Təkə meydan.

---

Batum – «Molla Nəsrəddin»in 29-cu nömrəsində «Dəmir oğlu Samancı Əyyub ağa»nın canını o qədər sıxmış ki, Məhəmməd ustadan qalan malın hamısını sərf edib, məqalə yazanı tapıb ürəyini boşaldacağına and içmişdir.

---

## MÜHÜM BİR İŞ

Rusiyada qənd karxanaları qəndin qiymətini artırmaq cəhətinə İran ticarətinə böyük mənfəət hasil oldu. Ticarət vüzəratının vurduğu hesaba görə ildə iyirmi milyon tümən İran pulu Rusiyada artıq qalıb, varidat mühüm dərəcədə artıb. Bu cəhətə Bakıdakı İran konsulu ən böyük qənd karxanasına İran dövlətindən bir «nişan» istədi. Tehrandan cavab gəldi ki, məşrutə zamanında nişanın qiyməti o ucuzluqda deyil ki, sən hesab eləmisən. Konsul cənabları çün qədim vəkil olmadığına, bu sözə etina eləməyib, Tehranda öz rəfiqləri vəkillərə yazdı ki, hökmən «nişan» alıb göndərsinlər.

*Doğruçu*

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*



*Tərcüməsi: Böyük Allahın adı ilə üç otaq kirayə verirəm. (Red. - T.K.)




Yevropa məktəbi.

1 şəvval 1328 **Beşimci il** 22 сентября 1910 г

# ملا نصر الدين

№35 Qiymәti 12 qәpik.

# МОЛЛА НАСРЕДДИНЪ

Цена 12 k. № 35



Təchizim hazır olmamış heç kəsə rəfiqə olmaram.

Litoq. S.Bıxova.

## ƏDƏBİYYAT

***İdarədən:** Möhtərəm oxucularımıza məlum olsun ki, bu axır vaxtlarda bir neçə dəfə jurnalımız təb olunandan sora intişar tapmağa bir para manilər peyda oldu. Bundan belə jurnalımız həftədə bir dəfə əvvəlki qərar üzrə təb və nəşr olunacaqdır.*

**«Dabanıçatdaq xalaya»**

Dəxi bundan sora sən bir də qırıldatma, xala!
Atılıb ortalığa düşmə, fırıldatma, xala!
Ölçə-ölçə əlini, qollarını atma, xala!
Söyləyib çox, gözünü, ağzını oynatma, xala!
Verməram sözlərinə bircə çürük qatma, xala!

---

A başı küllü, dabanı iki yerdən çatdaq,
Üstü-başı tökülüntü, əl-ayağı batdaq,
Ölü, tənbəl, vecə gəlməz, qoca, köhnə fartdağ,
Xanım oldunmu, səsin gəlməyir? Aldatma, xala!
Verməram sözlərinə bircə çürük qatma, xala!

---

Bilmirəm, Həccə gedibsənmi ki, gəlmir xəbərin,
Ya gedibsənmi o dünyayə, uzaqdır səfərin,
Ya düşübsən əlinə Hacı Vəli piləvərin.
Necə işdir, mən ölüm, söylə, yalan satma, xala!
Verməram sözlərinə bircə çürük qatma, xala!

---

Bəs nə oldu ki, yazırdın bizə əhvalınızı?
Bildirirdin həvəsü xahişü amalınızı.
Qorxuyorsan yollar yoxsa ki, ağ yalınızı?
Qorxulu sözləri sən də yazına qatma, xala!
Verməram sözlərinə bircə çürük qatma, xala!

---

Sən demirdinmi gərək arvada hürriyyət ola?!
Elm ola, məktəb ola, fənn oxuna, sənət ola.
Bilmüsavi hamı, istər ər ola, övrət ola.
Mən demirdimmi çəkil, beynimi laxlatma, xala?!
Verməram sözlərinə bircə çürük qatma, xala!

---



Deyəsən indi xəcalət çəkiyorsan sözünə,
Qayıdırsan dalı, lənət oxuyursan özünə,
O gurultu bumudur? Daş başına, kül gözünə!
Üstünü bas, açılar, bir də qımıldatma, xala!
Verməərəm sözlərinə bircə çürük qatma, xala!

---

Alışıb çıxdınız ortalığa kibrit kimi,
Girdiniz tez genə çadirşəbə ifrit kimi...
Gəldi bir səs, sora nazildi dalı fit kimi,
Yağmaya-yağmaya bihudə guruldatma, xala!
Bu xəcalət tərinə bizləri islatma, xala!
Qucuyub dizlərini, əllərini çatma, xala!
Sallayıb dimdiyini, mürgüləyib yatma, xala!

*Köhnə dostun: Məşədi Sijimqulu*

## ŞƏRİƏTƏ TƏTBİQ

Biz keçən otuz dördüncü nömrəmizdə iki cürə şəkil çəkmişdik. Birinin altında «Yevropa məktəbi» və birinin altında «Aziya məktəbi» yazılmışdı. Xırdaca balalar birinin bir qapısından daxil olurdu, o biri qapısından mükəmməl insan xaric olurdu. O birinə də genə xırdaca insan balası daxil olurdu, amma çıxanda nələr çıxırdı, hər kəs o nömrəni görüb bilir.

Bunu biz demirik, bunu ümum kafirlər deyirlər. Yəni Aziya məktəbləri insanı təbii halından çıxardır. Məsələn, altı yaşında bir balanı aparıb qoyasan dağda qoyun otarmağa, heç şəhər və camaat üzü görməyə, otuz ildən sora onu gətirəsən insan içinə və başlayasan ona güzəranı təlim etməyə, hər nə təlim etsən və desən bisual-cavab qəbul edəcək. Amma haman yaşda bir uşağı da apar müqəddəs şəhərlərin birində tüllab elə, iyirmi-otuz il orada təhsil eləsin, oradan çıxandan sora di gəl ona söz qandır. Orada o qədər xürafat onun başına, beyninə dolacaq ki, daha ona nə balta batar, nə kərki batar, nə mişar.

Ondan daha heç zad qayırmaq olmaz.

Sadəcə ağ kağız misli, nə qədər ki, kağız ağ və öz təbii halında qalıb, ona hər şəkil və surət çəkmək olar. Amma elə ki, hər yeri qaydasız cızılıb, qaralanıb, o daha bircə kəndli ermənilərə lazım olar, bir də abrazovannı müsəlmanlara.

---

İran əldən gedir.

İran əldən gedir, bir tərəfdən də beş nəfər üləma gətirib əyləşdiriblər məclisi-millidə ki, bunlar, qoyulan qanunu «şəriətə tətbiq» eləsinlər. Yəni sözün müxtəsəri ki, məmləkəti tapşırıblar haman jurnalımızda şəklini çəkdiyimiz Aziya məktəbindən çıxanlara. Əhali də bir camaatdır ki, durub kənardan tamaşa edirlər ki, bəli, ağalar qanunu «şəriətə tətbiq» eləyəcəklər.

İndi bu məclisdən nə gözləmək olar? Bu məclisdən bunu gözləmək olar ki, rəis məclisi açar və vükəlaya xitab eylər ki: «Həzərat, Tiflisdə bir Molla Nəsrəddin var, o Molla Nəsrəddin Hacı Seyid Nəsrullah ağaya sataşıb, gəlin onu müzakirəyə qoyaq.» Bəli o gün İran Məclisi-millisinin müzakirəsi o olar, və qət olunar ki, vüzəra vasitəsi ilə yazıb hökmən Molla Nəsrəddindən o məqaləni yazanın imzasını istəsinlər.

Daha bir nəfər tapılmaz ki, bunlara desin: «cənab vükəla. Bəlkə bir nəfər vəkilin ənisül-dövləsi abgüştü şit bişirdi, o da «Məclisi-milli»də müzakirəyə qoyulacaqmı?»

Canım, bir qəzet, ya bir jurnal, ya bir müxbir Hacı Seyid Nəsrullah və ya bir qeyrisinin şəxsinə toxunubmuş, qoy getsin özü öz şəxsi davasını çəksin, bunun «Məclisi-milli»yə nə dəxli?! İndi belə millətin məmləkəti əlindən gedərsə, müqəssir kimdir?! Belə millətə azadə yaşamaq yaraşarmı?

Bir xəlvət səhrada bir sahibsiz at və ya ulaq qala, onu orada qoyarlarmı? Əlbəttə, bir xaxoldan-zaddan tapılar ki, gedib tuta və palanı dalına qoyub başlaya onu yükləməyə.

---

«Şəriətə tətbiq» sözündən yadıma bir şey düşdü. O gün Orucluq bayramında Tiflisdə qəribə bir «şəriətə tətbiq» olub. Necə ki, məlumdur, sünni-şiə – hamı bayramı çaharşənbə günü elədilər. Amma üç nəfər Təbriz əhli (ki, bunların rəisi Təbrizdən təzə gəlib) bayramı «şəriətə tətbiq» elədilər.

Dedilər ki: «Xub, biz ki, bu gün bayram edirik, bəlkə bu gün bayram deyil (Girəm ki, on beş min Tiflisdə olan müsəlman bayram edib, onlar Qafqazda yaşayandılar, onlar çoxdan müsəlman deyillər). Ya bu gün biz bayram etməyib oruc tutsaq, sonra bəlkə bu gün bayramdır, onda ki, bizə haram olar.

Bəs nə edək? Yaxşısı budur bu işi «şəriətə tətbiq» edək, sübh tezdən gedib minək vaqona, gedək Ağstafaya və orucu da ki, yeyək. Əgər bu gün doğrudan bayramdır, biz də ki, yemişik, bayram hesab edərik, yox əgər bayram olmasa müsafir olub orucu yemiş olarıq, sora qəzasın tutarıq, bu da olar «şəriətə mütabiq.»

Bəli, «şəriətə tətbiq», «şəriətə tətbiq» belə olar.

İndi bax gör belə heyvanlara sahib lazımdır, ya yox? Özü də bu adamlar sadə ümmi adamlar deyillər ha! Aziya məktəbindən çıxanlardandırlar.

Demək, İran parlamentinə intixab olan beş müctəhid də bu adamlardan daha zorbası, daha yekəsidirlər. Onlar işləri daha yaxşı «şəriətə tətbiq» edəcəklər.

*Qızdırmalı*

---

## PANSİON

Mən lap uşaq vaxtımda elə xəyal eləyirdim ki, pansion görəsən nədir və mən çox vaxt atamdan və anamdan hey eşidərdim və mənə deyərdilər: «Oğlum, tez-tez yekəl, səni qoyacayıq rus xanımlarının yanına pansiona» və mən də rus arvadının adını eşidən gündən, gündə iyirmi




Bir məktəb şagirdlərinin məscidə camaat namazına getmələri.

dəfə ovurdumu püfləyib qoyardım ayağımın altına ki, bəlkə tez-tez böyüyüm, atam-anam məni görsün və qoysun pansiona çünki orada iş var idi. Bir gün mən bir yekə oldum. Yəni on iki yaşım oldu. Və o vaxt mən də hər zadı qanırdım. Mən başladım pansiona getməyə, yəni Tiflisdən gəlmə ikicə nəfər erməni qızının təlim və tərbiyəsinə qulaq verməyə və öyrənməyə... Mən gündə bu xanımları görüb hər saatda iki barmaq boyda yekəlirdim və heç bir şey də öyrənə bilmirdim. Elə ancaq bunu görürdüm ki, bir gün böyük qardaşım gəldi pansiona, başladı bu xanımlar ilə əl verib söhbət eləməyə, sora o birisi gəldi, bu birisi gəldi. Mən o vaxt bu xanımlara baxıb öz-özümə deyirdim: yazıq bizim evdəki xanımlara... Necə ki, bu saat bizim Naxçıvanda bir dövlətli gətirib və uşaqların da qoyublar onun yanına ki, guya təlim alsınlar. Amma bir vaxt görürsən ki, gecələr gül kimi tükəzbanları yuxuya verib və xanımları qoltuqlayıb Culfa sərhəddin ölçürlər, nə bilim gecələr bağda və qaranlıq küçələr ilə dolanırlar. Qərəz ki, çox işlər var. Hələ ki, bunu öyrəndim. İnşallah, bir aydan sora lap kamil olub müfəssəl yazacağam.

*Müxlisiniz: On iki yaşında uşaq*

## KEÇİMƏMƏSİ

Nuxada körpü qulağından sallanmışdım, yavaş-yavaş gedirdim qiraətxanayə tərəf. Onda gördüm dabanlarım qızıb, istəyirəm bazarın ortasında bir süzəm. Qərəz, at bağrı çatlada-çatlada kammerçeski bankın qabağından çıxdım yuxarıya, gördüm əcəb həngamədir: Kalus Apir gümüşlü zurnasını yelləyir, bir əmi də çuxasın çıxardıb əlində bir çirkli dəsmal, cibində bir çırt çubuğu, qaşlarını da dartıb yuxarı bir qəribə halət ilə Keçiməməsi oynayır. Molla əmi, cayi-şüma xali. Görməli məclis idi. Hətta mən özüm də əmilər ilə bərabər əl vururdum. Bəli, keçək mətləbə: bir yarım manatlıq bilet alıb keçib oturdum əvvəlinci cərgədə. Bir az keçmişdi gördüm yer sahibi gəldi əlində bir üç manatlıq bilet. Elə xəyal elədi ki, bura da murdar əcnəbi şəhərləridir, biletin nömrəsini oxuyub hər kəs yerində otursa durğuzacaq.

Bu xəyal ilə mənə yaxınlaşanda, mən yavaşca əlimi belimə uzatdım, hərif mətləbi anladı. Bir az ayaq üstə durub sora çıxıb getdi. Bəli, teatrdan danışırdım, mətləbdən uzaq düşməyək. Teatr nə teatr. Bəh-bəh-bəh, teatr göz, qaş, naz, işvə, qəmzə, sirkə, şirə, həm, hay, qır, çamxam, könül. Mən ölüm, Molla əmi, ürəyini sıxma, bunlar hamısı ötüşər. Ancaq mənə artıq ləzzət verən bu milli qəzəl idi ki, xanəndə oxuyurdu, biz də çırtıq vururduq:

Qurban olum qardaşına,
Yanındakı yoldaşına,
Məni dolandır başına,
Ləbdən, ləbdən, març, març,
Rüxdən, rüxdən març, març,
Həsi bala, mən ölüm, necə?

*Xortdan bəy*

*(Mabədi var).*

## TAPMACA

O nasıl yerdir ki, əhli büsbütün xulqandır,
Mollası dövlətpərəstdir, bəyləri şeytandır.
Zahirən şeyxi-tərəqqixah, lakin batinə
Ziddir elmə, bütün ürfan ilə ədvandır.
Xanları ruslaşmağıyla fəxr edir əcdadına,
Gərçi bunlar türkdür, mənşələri Turandır.

*Mütəhəyyir*

---

**Felyeton**

## MARALLARIM

Sər bəzəmin, dom bə hava mikonənd,
Yəni ibadət bexodami-konənd*.

Ramazan daxil olub, yarmarkalar... Mən də yarmarka deyirəm... məscidlər açılıb. Marallarım mətalarını hazırlayırlar, yəni moizə kitablarını rəfdən alıb, tozunu təmizləyib başlayırlar əzbərləməyi. Burada bir haşiyə çıxım. Siz belə güman edirsiniz ki, marallarım etdikləri vəzləri sinələrindən yainki başlarından buyururlar. Əstəğfürullah, bilməyən bilsin ki, bir nəfər Allah atasına rəhmət etmiş götürüb beş-altı yüz il bundan əqdəm bir vəz kitabı yazıb, o kitabda düz otuz dənə vəz var. İndi maralların o kitabı qabaqlarına qoyub, hər axşam bir dənəsini əzbərləyib, sabahdan gəlib camaata da nağıl edirlər. Mən bu haşiyəni maralların düşmənləri üçün çıxıram. Mənim marallarımı məzəmmət eləyirlər ki, heç bir təzə söz danışmırlar. Nə eləsinlər tarı bəndələri? Başda yox, sinədə yox, təzə sözü yerdən çıxarmayacaqlar ki?!

Maralım iftarı edib, təsbehi alır əlinə, başlayır hesablamağa: Bəzzaz Palazqulaq oğlu – otuz manat, Fərə Cəfər – əlli manat, Süpürgəsaqqal Rəhim – on manat, Dana Bayram – on manat, Körükburunoğlu – on manat, Çürük Mehdi – on manat, Yetim Dadaş – beş manat, Çıxçıx Fərzəli – beş manat, İşgəncə Kərim – beş manat, Zurna Balaxanımın uşaqları – on beş manat, Qaban Kazımbəy – bir at, ya əvəzində iyirmi manat, Quzğun Səfi bəy – bir çuval buğda, Keçəl Mirnağı – bir şaqqa keçi əti... Bu növ müridləri bir-bir sayır, sora üzünü tutur ortancıl arvada:

– A balam, nə qədər hesab eləyirəm altı yüz manat da düzəlmir, bilmirəm ki, neyləyim. Mənim ümidim bu ayadır, ramazana. Xatircəm olub min manatadək nisyə mal və borc pul almışam. Belə getsə axırda acından qırılarıq. Üç övrət, səkkiz nəfər uşaq, bunlar necə dolansınlar?! Keçmişdə hər ramazanda min beş yüz manatdan artıq əlimə pul gəlirdi. Bazar gəldikcə kasadlaşır, camaat dindən, məzhəbdən çıxıb, alimə etina etmirlər. Allah evlərini yıxsın bu uruscaq oxuyub camaatı yolundan çıxardanların. Məscidə gedirsən bomboş, amma teatr ağzınadək dolu. Buna nə deyərlər? Yəqin dünyanın axırı və Dəccalın xürucu yaxınlaşıb. A kişi, gör iş nə məqama ça-

* Tərcüməsi: Başını yerə qoyub, arxanı göyə qaldırırlar. Yəni Allaha ibadət edirlər. *(Red. - T.K.)*

tıb ki, Qanqal Sadıq ilə Kaftar Tağı da uşaqlarını uşqollaya göndəriblər. Dünən nə qədər nəsihət elədim, olmadı. Hər belə şeyləri gördükcə canım od tutub alışır. Bir az müddətdən sora şəhərdə bir müsəlman tapılmayacaq, axırda gərək biz də gedək hammallıq edək. Elə bilirsən mən hər gün məscidə namaz qılmağa gedirəm? Vallah yox, ciyərim od ilə dolu, mənim qulağıma namazmı girər? Namaz hardadır, əyilib-qalxmaqdan savayı bir şey yoxdur. Hər rükua gedəndə ki, paçamın arasından baxıb müridləri az görürəm, ürəyim qana dönür. Evin yıxılsın, qəzet yazan! Balaların qırılsın uşqol açan! Gorun od ilə dolsun teatr bina qoyan! A kişi, bunu Allah götürər ki, Qoyun Nəsir kimi Allah bəndəsi kişinin oğlu bığlarını qırxdırıb meydana çıxa, nədir mən teatrçı olmuşam? Pərvərdigara, birsən birliyin xatirəsi üçün fəryada yetiş! Dini-islam əldən getdi!

Bu halda maralıma xəbər gətirdilər ki, qiraət öyrənənlər gəlib yığılıblar. Maralım çətinlik ilə durub başını bulaya-bulaya keçdi o biri otağa.

*Ceyranəli*

---

## SEYİD ƏZİMƏ BƏNZƏTMƏ

Səni məşrutəçi bilmişdim, ay gic, bədədasanmış,
Üzərdə xoş, vəli batində bir mərdi-dəğasanmış.

---

Rəyasət şövqü imiş başını gərm eyləyən əvvəl,
Həvayi-zülmi-istibdad ilə bayraqgüşasanmış.

---

Səni əvvəlləri gördükcə əhsənlər oxurdum mən,
Qələtlər etmişəm, şayisteyi-bəd, bədduasanmış.

---

Səni mirati-amali-vətən bildi yazıq millət,
Bərabər durdu, amma əyri gördü, kəcnümasanmış.

---

Səni iranlılar adəm bilib qondardılar sədrə,
Fəqət adəm deyilsənmiş, gəda oğlu gədasanmış.

---

Eşitcək adını əvvəl, soruşdum: kimdi bu? Yaran
Sükut etdi hamı, bildim ki, bir əhli-cəfasanmış.

---

Səni hansı ana doğmuşsa da, İran böyütmüşdür,
Haram olsun sənə əmdiklərin, madərxətasanmış.

---

Əcəb hürr oldu İran, əhdinə yaxşı vəfa qıldın,
Səhabi-zülmü istibdadla, bərqi-bəlasanmış.

---

Qarışdırdın, pozuşdurdun, tutuşdurdun, vuruşdurdun,
Əcəb namərd, namərbutü bimehrü vəfasanmış!!!

*Kefsiz*

---

## XOLERA VƏ RAMAZAN

Bu axır vaxtlarda ramazanın yetişməsinə görə bəzi şəxslər başlayıblar ki, gərək oruc tutulmasın, çünki xolera vardır, oruc tutanlar ac olurlar və ac olan zamanda da xolera mikrobları tez sirayət edir. Məzəli budur ki, Soltanov da götürüb «Zaqafqaziya» qəzetəsində yazıb ki, xolera belə gəldi, oruc belə getdi və müsəlmanlar nə etməlidirlər. Nə bilim qədim zamanda il on üç ay olurmuş və orucluq həmişə qış vaxtına düşürmüş.

Bir deyən yoxdur, əzizim, hansı «tatın» kitabında vardır ki, il on üç aydır, nə vaxt olubdur ki, oruc tutanlar xoleradan ölüblər və sizə nə dəxli var ki, müsəlmanlar nə etməlidirlər? Bunların hamısı biclik və oruca «kələk» qurmaqdır. Əgər siz düz adamsız, özünüzə çarə edin, biz ilə nə işiniz var? Bizim sizə və sizin sözlərinizə ehtiyacımız yoxdur. Bizim elə mücrib dualarımız vardır ki, onu oxuyanda «vəba» gəlməsin ki, bütün dünya dağılsın, genə bizə bir şey olmaz. İnanmırsan aç «Zadülməad» kitabını və bu mətləbi oxu: «Əz-həzrət... mənqul əst ki, hər ki dər hər şəbi-rəməzan in duara: ... dər namazi-nafilə bəxanəd dər an sal əz-bəlaha məhfuz gərdəd».*

*Molla Fərəməz*

---

## İDARƏDƏN

Camaatdan çoxu bizdən dil ilə və məktub ilə giley edirlər ki niyə orucluqda Kərbəlayı Ağabala vaizin «orucu batil eləyən şeylər haqqında» elədiyi moizəsini aşkarən və müfəssələn yazmamışıq. Bir də yazıb onlara məlum edirik ki, elə məsələləri ancaq məsciddə və minbərdən aşkar danışmaq olar. Qəzetə və jurnala o tövr sözləri yazmaq heç yaraşmaz.

***Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə***



*Tərcüməsi: Həzrət... nəql edirlər ki, hər kəs ramazanın hər bir gecəsi bu duanı .... nafilə namazında oxusa, haman il bütün bəladan qorunar.*




Şuşa qalasında Qara İsmayılın toyunda.

16 ramazan 1328 **Beşimci il** 13 ноября 1910 г.

ملانصرالدين

№36 Qiymәti 12 qәpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 k. № 36




Әdibi-şәhir Qraf Lev Tolstoyun vәfatı münasibәtilә

## ƏDƏBİYYAT

*(Jurnalımızın qeyri şəhərlərdə olan vəkilləri bizə belə kağızlar yazırlar.)*

***Gəncədən:***

Əlli nüsxə jurnalı göndərmə birdən Gəncəyə,
Bax, hesab eylə bunu, endirgilən beşdən birə.
Həftədə on nömrə «Molla» sata bilmir uşaq,
Nə yalandır yazdığım, nə eyləyirəm məsxərə.
Baxma ki, əvvəl var idi əlli «illik» müştəri,
İndi bu etmiş tərəqqi, ta düşübdür on birə
Əğniyası Gəncənin oynar qumar, istər şərab,
İstəməz olsun evində nə qəzet, jurnal, kitab.

---

***Nuxadan:***

Bunca göndərmə bizə jurnalını,
Kişi, başdan eləyirsən malını?!
Andırın işləməyir, yoxdur alan,
Kəndimizdə hanı jurnal oxuyan?
Vurdu seylab dağıtdı Şəkini,
Yox alan jurnalının bir təkini.
Barı göndər üçünü, ya beşini
Çünki girlər beşi şəhrin işini.



---

***Bakıdan:***

Molla Nəsrəddin əmi, az göndər,
Bizə məcmuəni az yaz göndər.
Şoqərib qaldı, satılmır, ay atam,
Göndərirsənsə də az-az göndər.
Bizə jurnal, qəzetə göndərmə,
«Kök toyuqlar», cücələr, qaz göndər.
Bizə bundan nə çıxar, ay molla?
Bir neçə pullu qumarbaz göndər.
Elə irsal «yüz əlli» mütrib
Yüz kamança, iki yüz saz göndər.





---

***Şuşadan:***

Rəğbəti yox kimsənin jurnalına,
Meyli yoxdur gülməyə əhvalına.
Düşdü rövnəqdən gülüstanın, əmi,
Bir dua yazdır, kitab aç falına.
Halını böylə görən bir əqlsiz
Bağlıyır ümid istiqbalına.
Kəmfürüş oldu mətaın Şişədə,
Bir qəpik yox mənfəət bu peşədə.

---

***Ordubaddan (?):***

Molla, jurnalını göndər gəlsin,
Xoddadır, malını göndər gəlsin.
Gündə göndər iki-üç yüz nömrə,
Bildir əhvalını, göndər gəlsin.
Ordubad indi o əvvəlki deyil,
Kəbla saqqallını göndər gəlsin.
Mollalar da oxuyur məsxərəni,
Qeybətü qalını göndər gəlsin.

*Məşədi Sijimqulu*

---

## QEYDKEŞLİK

Ay mənim əzizim gəncəli Hacı Molla Əli əmi! Axı budur iki ildir ki, sən rahatını pozub özünü zəhmətlərə salmısan, mən də sənin zəhmətə düşməginə razı deyiləm. Sən elə bilmə ki, indiyə kimi Molla Nəsrəddin sənin işlərindən xəbərdar olmayıbdır. Yox, olubdur, ancaq biz əvvəllərin elə bildik ki, sən zarafat eləyirsən, sora gördük, xeyr, oğlan, sən lap köhnə işləri buraxdın.

Ay Hacı əmi! İndi iki ildir ki, sən başlamısan küçələrdə sərbəst və azadə dolanan yetim, sahibsiz, kasıb uşaqlarını tutub gətirib əyinlərinə paltar geydirib, qoltuqlarına kitab verib öz xərcin ilə məktəbdə oxutdurmağa. Nə bilim bir sənətxana da açıb arvada sənət öyrətdirməyə, ildə də bir-iki min manat bu yolda sərf etməyə. Ay Hacı əmi, axı sən bilmirsənmi ki, üsuli-cədid üzrə olan məktəb, dünya elmi oxunan məktəb, mollaya mənfəət çıxmayan məktəb ziddi-şəriət və günahi-kəbirədir? Allaha şükr, sənin molla dostların çoxdur, keçən il sənə ağamız, tacisərimiz tapşırmadımı ki, Quran və şəriət dərsindən başqa özgə dərs oxunmasa, yaxşı məktəbdir, savabı da artıq olar. Bəs sən nə üçün ona əməl eləmədin, sən niyə mollaları özündən rəncidə edirsən, yetim-yesir və ac bambılıların uşaqlarından ötrü niyə o molla aşnalarını incidirsən? O uşaqların dərdi sənə ki, qalmamışdı?! Gəl nəyə deyirsən and içib səni inandırım ki, il on iki ay şəriət dərdi çəkməkdən əriyib çöpə dönən mollaların, istər Hacı Seyid Bağır olsun, istər Molla Məsum olsun, istər bizim dostumuz və sənin də qardaşın Hacı Molla İsmayıl olsun, heç biri millət balalarından ötrü iki min qəpik sərf edib, ikicə dəqiqə də vaxtlarını onların yolunda sərf etməzlər və zəhmətlərini çəkməzlər. Bəs indi ki, mollalar eləmir, sən niyə özünü narahat edirsən? Məndən olsa bu ildən daha o məktəbin də, o filanın da ağzını bağlayıb, onlara xərc elədiyin pulları verərsən yaxşı sədri düyüsünə və sarı inək yağına, çağırarsan aşbazı, bişirər plovu, qonaq elərsən Gəncənin kəlpeysər Hacılarını, mollalarını və dövlətlilərini, gəlib yeyib-içib kefləri kökələr, ömrünə dua edərlər. Mollaların hərəsi də bir cümə surəsi oxuyar, bu da ölənlərin payı.

Ay Hacı əmi! Sən gəl bu qoca məşədinin qırmızı saqqalına qədir elə, boşla bu işləri, müsəlmana belə işlər ayıbdır. Canım, belə işləri eşidəndə az qalırıq utandığımızdan yerə girək.

*Hərdəmxəyal*

---

**«Günəş»in 15-ci nömrəsindəki qərib şairə nəzirə**

Bir yanımda südlü qəhvə,
Bir yanımda həlviyat,
Qəsrim içrə nazü nemət,
İşqabımda şirniyat,
İstolumda mürğü mahi,
Qənşərimdə müskirat.
Maşallah zad Allah,
Maşallah in həyat.

---

Bağü bağçam həp çiçəkdir,
Qönçələrdir laləzar.
Şirin alma, turş heyva,
Sarı armud, sürx ənar,
Şaxələrdə cəh-cəh eylər
Əndəlibü mürği-sar.
Maşallah zad Allah,
Maşallah in həyat.

---

Kassa içrə əskinasım,
Sandığımda ağ manat,
Banka içrə brilyantım,
Potrfeldə çox barat.
Seyrə çıxsam omnibusim,
Var səməndim köhlən at.
Maşallah zad Allah,
Maşallah in həyat.

---

Var madamlar, madmazellər,
Gül kimidir üzləri.
Tans edirlər mənnən onlar
Daim ovqat özləri.
Xansənəmlər qoy yox olsun,
Kor olsun gözləri.
Maşallah zad Allah,
Maşallah in həyat.

---

Hər uşaqlar oldu dahi,
Etdi tənqid milləti.
Abrudan düşdü varlı,
Getdi şanü şövkəti.
Bər cəhənnəm ac qalıbdır
Rəncbərlər külfəti.
Maşallah zad Allah,
Maşallah in həyat.

*Aşqabad, Xortdan bəy*

---

Şamaxıda müsəlman qiraətxanasının nəfinə oynanan teatrın biletlərinin satılmağı.




Biletsatanlar – Cənab Hacı, bir bilet alın.
Hacı Mürsəl – Mən bu qırx iki qəpiyi sizə belə verərəm, inşallah, mənim pulum teatra qismət olmaz.



Qəbristanlıqda tələbə: Yaş ağaclar quruyanda yandırmağa yaxşıdır.

**ELAN**

Hər kəs iki aydan-iki aya arvadını təzələmək qanunu öyrənmək istəyirsə, yazıb Batumda Əhməd Paşa caməsinin imamı Məhəmməd əfəndi cənablarından bu barədə müşarileyhin təzə yazdığı müfəssəl qanunnaməni ala bilər. Çünki bu cənab hər iki ayda bir ucdan birini alıb o birini boşayır. Müsəlman qardaşlara, ələlxüsus, mömin və müqəddəs kəblayılara və o cümlədən vaizi-atəşzəban Kəblə Ağabala əmiyə məsləhət görürəm ki, fürsətdən istifadə edib tezlik ilə bu işi öyrənsinlər.

*İmza: Üçgözlü*

## TAZİYANƏ

Kəndini molla eyşü ləzzətdə,
Bu cahan içrə bir həyat istər.
Mayeyi-eyşi etməyə əldə
Büsbütün milləti məmat istər.
Canını aldı vəqti-fürsətdə
Mürdəsindən də beş manat istər.
Mələkülmövtə heyni-rehlətdə
Yoxdu can verməyə bu millətdə.

*Kefsiz*

---

## TERROR

Dünyada hər şeyin bir səbəbi var və səbəbsiz də heç bir şey ola bilməz. Yeri-göyü yox yerdən xəlq eyləyən tək bir Allah hər bir şeyi bir zada səbəb yaradıbdır. Müsəlmanı da tək bir şeyə... O da nədi? Ev yıxmaq. Məsələn, bir həftə bundan müqəddəm dəhnəli Süleyman Hacı Əbdülkərim oğlunu jandarmski naçalnik tutubdur ki, sən terror dəstəsi saxlayırsan. Çox əcəb, çox yaxşı. Allah atana rəhmət eləsin, burada heç kəsin sözü ola bilməz, çünki insanın alnına nə yazılıb, elə də gərək olsun.

---

Amma mənə təəccüb gələn, məni heyrətə salan tək bircə sözdür. Mən indi sözümü deyəcəyəm, qoy oxuyanlar insaf ilə mülahizə eləsinlər. Söz də budur ki, müsəlmana oğurluq, yalandan and içmək, qız götürüb qaçmaq desən, yaraşar. Amma terror dəstəsi saxlayırsan deyəsən, yaraşmaz, çünki güncayişi yoxdur. Səbəbi də budur ki, müsəlmandır.

---

Bəs hər şeyin bir səbəbi olan kimi, söz yox ki, bunun da səbəbi var və səbəbi də budur ki, bu il yanvar ayında sərdarın hökmü ilə naçalnikin daznaniyasına gələn Baqatko cənablarına dəhnəli kəndinin əhli ilə bərabər Süleyman Hacı Əbdülkərim oğlu da naçalnik tərəfindən olunan zülmlərin şikayətlərini etmişlər. Budur, əzizim, işin səbəbi. İndi bildinmi? Yoxsa dəhnəli müsəlmanı, terror dəstəsi, heç gör güncayişi varmı?

*İmza: Dəhnəli*

## AĞDAŞDAN NAĞIL

Raviyani-əxbar və naqilani-asar belə rəvayət edirlər ki, Ağdaş mahalında Padar adlı bir kənd var idi və bu kənddə bir dövlətli və sahibehsan Hacı var idi.

Bir gün bu Hacı nə fikir eləyirsə, başlayır bu kənddə bir məscid tikdirməyə və əhd eləyir ki, məscid tamam olan kimi gərək o məscidə bir əfəndi tapıla ki, gözləri göy, başında tük əlaməti yox və adı da nəhs ola. Ravi söyləyir ki, bir gün məscid tamam oldu və oraya əfəndi qoymaq lazım oldu. Başladılar hər yeri axtarıb haman nişanlarda bir əfəndi tapmağa. Axırda Ləki deyilən bir kənddə sorağın verdilər ki, haman nişanlarda bir molla var: başında heç tük yoxdur, gözləri göydür və adı da Həsəndir. Min minnət ilə gedib bu əfəndini Hacı İsmayıl məscidinə gətirdilər. Həsən əfəndi məscidə gələndən sonra dərs deməyə başladı və hansı suxtəsinin yaşı bir balaca zəmanəyə mütabiq isə o suxtəni öz evində oxudurdu. Söz yoxdur ki, evdə yüngül həmlə xəta olmamış olmaz. Axırda genə bir gün evdə əfəndi ilə suxtəsi «cəhənnəm» oyunu oynayırlarmış, yəni əfəndi kafiri cəhənnəmə tullayırmış, arvadı əhvalatdan xəbər tutur və əfəndidən acıq eləyir, gedir atası evinə. İndi əfəndi nə illah eləyirsə arvadı başa sala bilmir.

Nə qədər deyir ki, ay arvad, kafiri cəhənnəmə tullamamışam, saxlamışam. Arvadı inanmır, deyir ki, cəhənnəmə gedən kafir daha mənə lazım deyil.

*Kürkücırıq*

*Mabədi var.*

---

**ELAN**

Məlum edirəm qəbristan əhlinə ki, Həcc ziyarətinə getməyimə görə öz yerimdə canişin qoyub gedirəm qardaşım oğlu Əli xanı. Hər kəsin naxoş arvadı olsa gətirə bilər onun hüzuruna.

*Şeyx Hacı Həmid Paşa*

## ORENBURQ XƏBƏRLƏRİ

«Vəqt» və «Məişət» təbirincə küreyi-ərzin ən böyük adamı millətin yol başçısı olan M.bay vəfat edib. Orenburqun parlaq ulduzu söndüyündən, şəhərimiz zülmət içində qaldı. Şimdi vəqtçilər də, məişətçilər də qaranlıq səbəbinə gündüz belə fanar ilə gəzirlər. Mərhum M.bayın cənazəsində yüz rublə sədəqə almış mollalar genə birər təzə arvad alıb kef və səfa edirlər.

---

Buxara əmiri Peterburqa gedərkən Orenburqdan keçmiş isə də, bilməm nə üçün şəhərimizdə müsafir olmadı. Binaənəleyh bir çox madamlar əmirin ehsanından, qaradavoylar medalından məhrum oldular.

## TELEQRAF XƏBƏRLƏRİ

Tehran – Keçən gecə bələdiyyə məclisinin vəkili və təhvildarı Mirsadıq ağanın əlindəki beş şahı, hərifinin əlində olan beş asına müsadif olub üç min səkkiz yüz manat biçarə bələdiyyənin pulunu uduzdu.

Culfa – İran gömrüyündə qulluq edən xanların məvacibləri rus tərəfində olan mehmanxanalardakı xərclərinə kifayət etmədiyinə görə cümə və sair bayram günlərində ki, gərək gömrük bağlı olsun, vaxtlarının saatını tacirlərə doqquz qrana satıb işə məşğul olurlar.

---

## QAFQAZ XƏBƏRLƏRİ

Aşqabadda olan türkmən camaatına məlum olsun ki, «Firudini» məktəbinə türkmən balalarını qəbul eləmirik. Səbəbi: hərçənd məktəbin adı Firudinidir, amma əsl adı «şiə» və qarabağlı məktəbi olmağına görə sovetdə məsləhət olmadı. Amma pullarını hər gün və hər dəqiqə qəbul edirik.

Sədr: Aslan bəy Nəsirbəyov

Pomoşniklər: Bolşoy Hacı Həmid və şəriətə xəyanət etməyən Mirzə Bəşir.

*Xəzinədar: Məşədi Cabbar*

---

## AŞQABAD

«Sport» klubunda qəzet stolunun üstündə həmişə rus və erməni qəzetləri və məcmuələri tapmaq və oxumaq mümkündür. Bunların içində hərdən görürsən Molla əmi də qapının arasından baxıb gülür. Bir nəfər rus məndən xəbər aldı ki, «nə səbəbə bu Molla həmişə qəzetlərə baxıb gülür?» Doğrusu, birdən-birə mən buna cavab verə bilmədim və duruxub qaldım. Yanımızda klub qulluqçularından birisi durmuşdu. Bu bizim söhbətimizi eşitcək dedi: «Səbəbini mən deyimmi?» Dedim, Allah atana rəhmət eləsin, məni bunun sualından xilas elə.» Dedi: «A kişi, peşimansan stolun üstünə bir müsəlman qəzeti və ya jurnalı qoyasan, o saat zalım müsəlmanlar onu göydə götürürlər». Doğrusu, mən buna inanmadım, çünki müsəlmandan belə iş çıxmaz.

*Eşşək arısı*

---

## PETROVSKİDƏN

Molla əmi! Doqquz nəfər yoldaşlarım ilə bərabər gedim Ağa Məşədi İbrahim Mərəndi Hacı Molla Qivamın 70 yaşında müridinin aşpazxanasına, bir nəfər ilə qumar oynadım, əlli manat pul uddum. Vəchindən beş manat yer pulu müşarileyh müridə verdim və qalan qırx beş manatı da yoldaşlarım ilə pay-püşk elədim. Hərəmizə dörd manat yarım düşdü. Sora bizim naib konsul Mirzə namənə ... xan Çomaquddövlə bu işdən xəbərdar olub, məni hüzuri-müqəddəslərinə istəyib hökmən əlli manatı məndən geri almaq istədi. Nə isə, mən əhvalatı başdan-ayağa nəql etdikdən sora mənə acıqlandı ki, ay lotu qumarbaz, dörd manat yarıma mən xalça ala bilərəm?! Heç olmasa üstünə də qoyub on manat ver ki, bir dənə divar xalçasısa da alım və illa çox danışsan, əlimdə olan hökmün mövcibində səni yataba qoşaram və cəmi qumarxanaları da bağlaram! Mən də istəmədim ki, Petrovskidə iranlıların Əncüməni-xeyriyyəsini Hacıbəyov bağladan kimi bu da qumarxanaları bağlada, biçarə müsəlmanlar başıpozuq qalıb çöllərə dağılalar. Ona görə də ləzgi İsrafildən beş manat borc alıb, məndə olan pulun üstünə qoyub doqquz manat verdim cənab naib konsula və xahiş elədim ki, qumarxanaları bağlatmasın. Yaşasın millət qeydinə qalan məmurlarımız!

*Qumarbaz*

---

## NAXÇIVAN

Naxçıvanda bir elə təzə əhvalat yoxdur, məgər bir neçə gündür ki, şəhər mollaları qapıların qabağında qonşu divarının sərhəddinə kimi hər gün səhər, axşam iki dəfə bərk suluyub süpürürlər ki, qış tədarükündən ötrü gətirilən qovurmalıq qoyunların rəddi bilinməsin.

---

**Dəyənək**

Vükəlayi-millətə

Gəlməsə Batmanqılınc İrana nəzm etməz qəbul,
Cəlb edin ol zatı fövriyyətlə Allah eşqinə.
Yoxsa baş tutmaz sizin məşrutəniz, eylər üful,
Bəlkə qamçıyla sizi islah edə şah eşqinə.

*Cüvəllağı*

***Müvəqqəti müdir: Məhəmmədəli Sidqizadə***

## ELANLAR




– Adə, Kəblə Heydər, bax, o qabaqda gedən mənim arvadımdır, donquzun qızı səhərdən-axşama kimi işləyir, heç yorulmur.

29 zilqədə 1328 **Beşimci il** 20 ноября 1910 г.

# ملا نصر الدين

№37 Qiymәti 12 qәpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 к. № 37



Litoq. S.Bıxova

– A balam, bu gözəllikdə qız niyə indiyə kimi evdə qalıb, ərə verməmisiniz?

– Zamanənin başı batsın, heç daha gözəlliyə baxan varmı? Hər kəs gəlir, elə əvvəl soruşur ki, savadı-zadı necədi, yazı-pozu bilirmi?

## ƏDƏBİYYAT

*Ədibi-əzəm mərhum Ziya paşaya bənzətmə*

Qafqazda qəzetxanlığa rəğbət yeni çıxdı,
Əvvəl yox idi, şimdi bu bidət yeni çıxdı.
Məktəb çoxalıb nəşri-maariflər açıldı,
Xassə Bakıda nuri-həqiqət yeni çıxdı.
Alimləri tənqid eləmək düşdü arayə,
Biçarə axunddan da şikayət yeni çıxdı.
Vaizləri təhqir eləmək qaidə oldu,
Uçtellərə ənamü inayət yeni çıxdı.
Haqq söyləyənə «babi» deyirdik keçən əyyam,
Babilərə ancaq ki, riayət yeni çıxdı.
Jurnal yazaraq Molla, çəkir şəkli-ümumi,
Puç oldu risalə, bu hekayət yeni çıxdı.
Keçmiş şüəra növhə yızıb, həcv deyirdi,
Bu nəzmü qəvafi belə adət yeni çıxdı.
Əvvəl füqəra ac da qalırdı küçələrdə,
Miskinlərə təmini-məişət yeni çıxdı.
El söhbətini qırmızısaqqallar edərdi,
Əfkari-cəvanə təbəiyyət yeni çıxdı.
Mollalar imiş millətə pabəndi-tərəqqi,
Aydın gözümüz, işbu rəvayət yeni çıxdı.
Məcmuədə Molla üləma eybini yazdı
Ürküşdü müridlər, hərə bir kuçəyə dazdı*
Məsciddə görüb bizləri sanma üləmayız,
Biz bir sürü alim sifətində budalayız.
Alimdə əməl olmalıdır, bizdə ki, heç yox,
Dildadeyi-alayişə nirənci-həvayız.
Əbnayi-vətən qovsa bizi, getməyə yer yox,
Düşsək səfəri-qürbətə, möhtaci-duayız.
Bir şeyyi-qəribiz, iki xasiyyətimiz var,
Əmmaməli candarmalarız, həm füqəhayız.
Hərçənd durur firqəmiz altında künuzat,
Amma genə yüzlüklərə hər dəmdə fədayız.



*Dazdı – türkcə «qaçmaq» mənasındadır.

Məzlumların borcudur etmək bizə təzim,
Biz zalım isək də, genə onlara ağayız.
İslama yarar bizdə bir iş yoxsa da, barı
Azadə gəzib müftə yeyən əbdi-riyayız.
Jurnal-qəzetə açdı işin üstünü yeksər,
Getdi şərəfü şövkətimiz, şimdi gədayız.
Qalmış yadımızda dadı əyyami-qədimin,
Əfsus o şərəfdən neçə ildir ki, cüdayız.
Adət belədir yığdığını kəsməyib heç kəs
Rəhm et, ay Əmi, bizlərə, məxluqi-xudayız.
Jurnal deyil, saheyi-dünyayə cərəsdir,
Rəftar elə bir növ, bizimki bizə bəsdir.

*Aşqabad, Xortdan bəy*

## QRAF L.TOLSTOY

Bu bir addır ki, insanlıq adilə adlanan cəmi məxluqun yanında altmış ildən bəri ehtiram ilə çəkilib. Milyonlarla zəhmətkeşlər, kəndlilər, yavan çörəkdən ötrü gecə-gündüz çalışanlar bu adla özlərinə təsəlli veriblər. Milyonlarla üdəbalar, şüəralar, müsənniflər, mühərrirlər, hətta milyonerlər belə bu ad sahibin vacibül-ehtiram bilirlər.

Bu noyabr ayının yeddisində hamı gördü ki, bu ad sahibi, yəni qraf Lev Tolstoy insaniyyət aləminə xidmət eləməkdən istefa verdi. Hamı gördü və eşitdi ki, bir ucu Amerikadan, Asiyadan tutmuş, Afrika və Ümumyevropa aləmində bu istefadan naşi nə qiyamət qopdu.

Mən bilmirəm niyə belə olur?

Nədən elə politika aləmində Bismarklar, sənaye və ixtira aləmində Edissonlar, mürəbbilik və ədiblik aləmində Tolstoylar və başqaları elə Yevropadan və Amerikadan çıxır? Elə xristian arasından qalxır? Məgər Asiya əhli başqa bir məxluqdur? Məgər onlar növi-insan deyil? Məgər onların başları və burun-qulaqları başqadır, bunlarınkı başqa? Əgər başqa deyil, bəs nədən belə olur?

İndi sən qulaq ver, mən deyim nədən belə olur. Əgər ağlın kəsməsə, sora sən də öz bildiyini deyərsən, mən qulaq asaram.

Bəli, Asiyadan da belə adamlar çıxır, amma ağzı özgə bir yola düşür.

Ərz olsun xidməti-şərafətməabına ki, növi-insan birdir, istər Yevropa bağçalarında gəzə, istər Hindistan meşələrində otluya, heç fərqi yoxdur. Onlarda da, bunlarda da gah-gah elə xariqüladə insanlar əmələ gəlir ki, nisbətən sair insanlara əqldə, dərrakədə, elmdə, zəkada, fikirdə, şüurda və hər bir şeydə başqalardan imtiyazlı olur.

İndi, əzizim, iş bilirsən nədədir? İş həm əsərdədir, həm müəssirdə.

Yəqin ki, qanmadın. Qoy lap yaxşı başa salım.

Məsələn, Asiyada bir nəfər insan əmələ gəlir ki, çox qabil, çox kamil, qüvvəsi, kəlamatı, yazısı, təsnifatı, hər işi və hər hərəkatı sair insanlardan fövq və əla dərəcədə olur. Bu adamın barəsində o saat camaat iki hissə olacaq: bir hissəsi dərhal bunu təkfir edəcək, qətlinə fitva verəcək. İkinci hissə nə edəcək? Onlar da bu adamı necə ki, var, elə görməyəcəklər: bunu övliya, imam, peyğəmbər, bəlkə Allah yerində tutacaqlar. Öz hərəkətləri ilə, öz itaətləri ilə, müxtəsəri-kəlam, zəbani-hal ilə bu adama qandıracaqlar ki, sən mavərayi-bəni-bəşərsən. Biçarəni bir özgə məqam iddia eləməyə vadar edəcəklər. O adam da yavaş-yavaş şübhəyə düşüb özünü müstəhəq bilib, bir mövhumi məqam iddia edəcək.

İndi əhali oldu iki hissə: bir hissə bunu təkfir edən, o biri də təqdis edən. Odu vurhavur başlandı, yüzlərlə, minlərlə, bəlkə yüz minlər və milyonlarla canlar tələf oldu. Axırda əgər səbəblərdən bir səbəblə, təkfirçi tərəf qalib oldu, o birilər müzməhəl və bərbad oldu, vaqeən elə onların kafirliyi təsdiq olunub əbədi batil adlanacaqlar. Yox əgər o tərəf qalib oldu, bir təzə din, bir təzə şəre ya bir təzə məzhəb də dünyada əmələ gəldi.

Məsələn, Məzdək İranda, Müslimə Ərəbistanda məğlub oldular. Odur ki, müzməhəl olub, adları da əbədi kafir və zındıq qaldı. Amma Brahma Hinddə, Konfisius Kitayda bir əsaliblə faiq gəldilər, bir şəre, hesab olunub getdilər.

İndi bizim bu cəfəngiyatı yazmaqdan məqsudumuz budur ki, Asiyadan çıxan dahiləri, müstəhidləri, Tolstoy və Edissonları ya təkfirçilər müzməhəl edib qurtarıblar, ya təqdisçilər biçarələri mühüm iddialar etməyə vadar ediblər, qoymayıblar ki, istedad öz təbii halında getsin, aləmi-bəşəriyyətə öz fitri qaydasınca xidmət etsin.

Amma yevropalılar belə olmayıblar, hər kəsi necə ki, var elə də tanıyıblar. Bismarkı kəmərbəstə, Edissonu sahibi-ecaz, Tolstoyu kəlamın vəhyi-asimanı bilməyiblər. Və habelə təkfirçilərin təkfiri də onlara əsər etməyib və etmədi də. O idi Tolstoyu təkfir eləmək, ancaq bir neçə nəfər ruhani... və siyasi yanında məhdud qaldı, əhaliyə təsir olmadı. Əgər bir elə adamı elə nüfuzlu kimsələr Asiyada təkfir etsəydilər, biçarənin işi bitib getmişdi. Nə onun şəni qalmışdı, nə yazıları intişar tapmışdı və nə də namü nişanı var idi. Çünki Asiya camaatının özlərində qövr və təəmmül yoxdur, hamısının cilovu hər yerdə bir neçə nəfərin əlindədir, haraya sürsələr oraya gedəcəklər. «Ağa deyir: sür dərəyə, sür dərəyə».

*Cəməri*

---

## TELEQRAF XƏBƏRLƏRİ

Vladiqafqaz – Neçə müddətdən bəri Hacı Məhəmmədsadıq ağanın təhti-sədarətində yığılan ianə pulları ilə qəbristanda təzə tikilən mərizxana açılıbdır. Budur mərizxana açılandan daha bir kəs naxoşlamır. Mərizxana bütün-bütünə boş qalıbdır.

---

Ürgənc – Buranın yerli müsəlmanları rəislərin və dövlətlilərin təşviqilə 25 min manat cəm edib bir üsuli-cədid məktəbi açmaq istəyirlər. Lakin qabil üsuli-cədid müəllimi tapılmadığına görə Buxarayi-şərifə Gilan qazisi həzrətlərinə teleqraf vurub bir üsuli-cədid müəllimi istədilər.

---

(Təbriz müctəhidləri)




Təbrizdə: Tağızadənin küfrünə fitva.




Müsəlman gimnazistləri müsəlman teatrında.

Ordubad – Mirmurtuza ağa öz fikri və zəhməti ilə qayırıb başa gətirdiyi ayropalan (hava gəmisi) ilə dünən Şulum xan meydanında 8 dəqiqədə 3 verst ucalıqda qalxıb bir dövr vurub salamat yerə enmişdir.

---

Naxçıvan – Dünən Gülsənəm xanım hamamda Pəri xanımın başına su tökməyib bietinalıq etdiyinə cəhət, Gülsənəm xanımın qonşuları Pəri xanımı baykot eləyib dəxi onu bazar hamamına qoymurlar. Gülsənəm xanımın ürəyi bərk sıxılır.

---

## İRAN İŞLƏRİ

Molla, İran işləri, xüsusən Azərbaycan tamam düzəlib, necə ki, sənin kefindir. Bir kəlmə yalan yoxdur, hər nə yazıram inan. Tamam idarələr Avropa qaydasıyla işə düşüb fır-fır fırıldayır (heç çərxi-dəvvar də belə fırıldaya bilməz). Hər kəs hər nə desə, inanmayasan, qərəzlən deyirlər. Bax o ki, Əncüməndir, ona heç söz yoxdur, o elə əvvəldən yaxşıdır. Hər kəs desə ki, neçə nəfər dübəng oturublar orada, noxud falı açırlar, inanma, böhtandır. Şeyx Səlimin bitlərinin bərəkətindən elə şeylər ola bilməz.

Bir də, xudanəkərdə, birisi gəlib sizə deyə ki, Təbrizin iki yüz əlli min nəfər camaatının məktəbləri ibarətdir iyirmi beş köhnə məktəblərdən və hər birində də iyirmi beş uşaq inanma, bu lap qərəzdir. Hə, genə hər kəs desə ki, əvvəl-axır iki-üç təzə qayda ilə məktəb var və ağaların hamısı niyyətlərin bu yerdə qoyublar ki, onları da dağıtsınlar, əgər buna inansanız, məni lap bir böyük dərd altında qoyarsınız.

---

Əyalət tərəfindən elan olunur ki, bundan sora mərsiyəxan, dərviş, naqqal, fal açan, çavuş və mütrib kimi adamlar «kəsbi-ruzi» üçün İrandan Qafqaza getməsinlər. Çünki onların hamısı üçün Təbrizdə təzə açılan qanuni idarələrdə işləri nəzmə salmaqdan ötrü lazımdırlar; məvacib də əlli tüməndən üç yüz təmənə qədər, mədaxil hər kəs nə qədər bacarsa. Əgər özləri də müstəbid və «islamiyyə» tərəfindən məşrutəçilərə güllə atanlardan olsalar, daha gözəl olar.

Hə, bir söz yadımdan çıxdı, qoy onu da deyim: yazmışıq Tiflisdən Kəblə Ağabala əmi də gəlsin, bu kişinin daha dəxli yoxdur...

---

Xoy – Molla əmi, istəyirəm Xoyun güzarişatından bir neçə kəlmə qulluğunuza ərz edim. Əvvəla, o sözlərin biri budur ki, idareyi-nəzmiyyənin üçüncü dairəsində, yəni üçüncü uçastkada xoruz döyüşdürməkdən başqa bir şey görmədim. Nə dəftər, nə mirzə. Ancaq bir səri-nəzmiyyə, yəni pristav var idi və bir neçə nəfər müavinləri məmləkətin mühüm işlərinə məşğul idilər.

2) Xoy darülmömininin olmağa görə fahişəxana açmaq bərk qadağandır. Ancaq xalqın işi yola getməkdən ötrü bir «erkəkxana» sabiq Naibülhükəma Əzazüddövlənin evinin qabağında açılıb, qapısı da əvvəli-şəbdən sübhə kimi müştərilərin üzünə açıqdır. Makuluların yeri boş. Məşrutə elə bircə Xoy əhlinə düşüb. Xan hamamında da «Erkəkxana» düzəldiblər. Yaşasın Xoy əhli. Bir də cənab Şeyx Fəzlullah, yəni Mirzə Ağabala mücahidin qətlinə fitva verib öldürtdürən ağa elə məhbubül-qülubdur ki, hər nə desə camaat Allah tərəfindən nazil olan sözlərdən hesab edirlər. O cənabın moizələrindən birisini aşağıda yazıram ki, onun nə olduğunu biləsiniz.

**Moizə:**

Camaat!·Bu hal ilə və bu xəyal ilə ki, sizlər varsınız, Allah Cəbrailə hökm edəcək ki, Ağrı dağdan bir daş götürüb sizin başınıza salsın. Necə ki, bir dəfə Allah Cəbrailə dedi və o da gedib Fələstin dağından külüng ilə bir yekə daş qoparıb aldı başına, gətirib saldı xalqın başını əzdi və bunu da biləк ki, haman daşın eni burdan Azaba və uzunluğu da Qara Şabanlı imamzadəsinin yanında idi.

---

## BU DA, YAHU, KEÇƏR

Mollanüma ziddidir elmə əgər,
Arif olan kimsəni təkfir edər.
Uyma bu dünyaya fənadır deyər,
Dinmə, danışma, bu da, yahu, keçər.

Gündə əvamı başına yığsa da,
Zalıma, cəbbara dua qılsa da,
Xəfyə olub izzətə gər çatsa da,
Dinmə, danışma, bu da, yahu, keçər.

Hər nə cəfa görsə rəva millətə,
Tuş eləsə ümməti hər zillətə,
Hər nə edə layiq ola nifrətə,
Dinmə, danışma, bu da, yahu, keçər.

---

## SƏBƏB

Nə qədər ki, qəzetələrdə yazırlar və söyləyirlər ki, müsəlmanların oğru, yolkəsən, qoçu və adam öldürən olmaqlarının və sair pis işlərinin səbəbi cəhalət və elmsizlikdir, mən heç inanmıram. Əgər doğrudan da bu işlərin səbəbi elmsizlikdir, pəs nə üçün ermənilərin və başqa millətlərin avam camaatı belə işlərə mürtəkib olmurlar? Elə həmişə belə işləri eləyənlər müsəlmanlardır. Mən bu işdə lap mat qalmışdım və nə qədər fikir eləyirdim başa düşə bilmirdim. Ancaq bu günlər Məclisinin «Zadül-məad» adlı kitabında bir belə mətləb gördüm: «Əz-həzrət ... mənquləst ki, hər ki, əhya konəd şəbe-qədrira, qonahaneamərzidə şəvəd, hərçənd beədəde setarehaye aseman və səngine kuhha və kolle dərya başəd».*

Sora anladım ki, bu işlərin hamısının səbəbi və baisi Məclisi məhrumun bilə-bilə qayırma rəvayətləri imiş. Hər kəs nə deyəcək, desin, mən qeyri şeyə inanan deyiləm, vəssəlam!

*Füzul*

---

*Tərcüməsi: Hər kəs Qədir gecəsi oyaq qalsa, günahları ulduzların sayı, dağların ağırlığı, dənizlərin ənginliyi qədər olsa da, bağışlanar. *(Red. – T.K.)*

## MOSKVA–GƏNCƏ

Moskvada olan erməni studentləri, millətlərini rus ədəbiyyatı ilə aşina etməkdən ötrü bir çox kitablar rus dilindən erməni dilinə tərcümə edib və təb etməyə bir cəmiyyət tərtib etmişlər. Bu saatda neçə kitablar çapdan çıxıb nəşr olunmaqdadır.

---

Gəncədə bir mollanın neçə nəfər müəllimləri kafir adlandırdığından və müəllimlərin bu işdən ürəkləri sıxıldığından bu günlərdə müəllimlərin kafir olub-olmamaqlarını isbat etməkdən ötrü bir həkəm məclisi tərtib edib işə baxıldı. Neçə batman söhbətlərdən sora məlum oldu ki, müəllimlər kafir deyilmişlər. Müsəlmanların nəzərini bu işə cəlb edib hər yerdə belə həkəm məclislərinin tərtib tapmağını ürəkdən arzu edirik.

Amma bir iş var ki, bura Gəncədir, ora Moskva. Olar studentdir, bular molla (?)... Bular Aziya məktəbindən çıxıblar, olar Yevropa.

### ELAN

Yazıb hamı müsəlman qardaşlara və mömin Hacı əmilərə məlum edirəm ki, neçə il zəhmətdən sora rибanın* halal olmağından ötrü təzə bir qayda icad etmişəm. Hər kəs istəyir ki, icarəyə pul versin və haram olmasın, bu aşağıda yazılan qaydanı əmələ gətirsin.

Verdiyi pulu, qızıl və ya kağız, bir dəsmala qoyub desin ki, bu məbləği sənə verirəm filan müddətə kimi, hərgah qızıl verirsə, vəchində gərək kağız ala, əgər kağız versə gərək qızıl alsın, əgər bu işin günahı-zadı olmuş olsa mən zaminəm.

*Hacı Qənbərəli*

## HACITƏRXAN

Çoxdan bərk qapadılmış «Müzəffəri» məktəbi genə təzədən Əncüməni-xeyriyyənin təhti-nəzarətində olaraq açılıb, dərslər başlanmışdır. Hər bir iş öz qaydası ilə gedir. Məktəbin damının, novdanlarının dibinə torpaq tökülür, damlarının qarını tökməkdən ötrü üç dənə kürək alınıb.

---

## ƏCAYİB MƏXLUQAT

– Dünyada hər zaddan böyük nədir?
– Cəbrayılın qanadı.
– Xeyr, bundan böyük nədir?
– Bundan böyük «Səda»nın səhifəsi ki, Gəncəli Axund Hacı Molla Həsənin məqaləsini yerləşdirib.
– Xeyr, bu da olmadı, bunlardan böyük nədir?
– Bunlardan böyük Gəncə inteligentlərinin hövsələləri ki, dörd-beş gün özlərini avara edib, bir həkəm məclisi qurub, Hacı Molla Həsən ilə beş-altı saat dizbir əyləşib bir mühüm məsələ barəsində danışıblar.

*Yəcuc*

*Sələm (Red. – T.K.)

## POÇTA QUTUSU

Ordubadda «Qəmiş» imzalı kağız yazana: Doğrudan da ki, qəmişsən.

---

Aşqabadda «Hacı Əsədulla barəsində» yazana: Həzrət Musanın boyu otuz ərəş idi, otuz ərəş də əsasının boyu idi, otuz ərəş də hoppanandan sora Övc ibn Ünqün topuğundan ağacının ucuyla vurardı. Əgər Həzrət Musanın əsası sizin məktubunuzun uzunluğunda olsaydı, ona heç hoppanmaq lazım gəlməzdi.

---

Şamaxıda «Bir nəfər»ə: Hələ bir az səbr elə, görək bəlkə rəhmə gələ.

---

Ağdaşda «Həmşəhri»yə: O barədə sonralar bəlkə bir az danışarıq.

---

Gəncədə «Fəqir»ə: Gözdə-qulaqda ol. Həkəm məclisi açılan kimi özünü ver ora. Elə zadları orada tez öyrənə bilərsən. Bacarsan ora üzv yazıl.

*Müvəqqəti müdir: Məhəmmədəli Sidqizadə*

## ELANLAR

İstanbuldan təzə aldığımız kitablar:

Yeni tarixi-osmani, Təlimi-qiraət – Müəllim Naci 1-ci, 2-ci, 3-cü, 4-cü və 5-ci qisim, Coğrafiyayi-ümumiyi-atlas, Kiçik coğrafiya, əvvəlinci ildən ötrü qiraət kitabları, Əxtəri-kəbir, Qamusi-fransəvi. Xahiş edənlər Tiflisdə, Voronsovki küçədə Məhəmmədzadəyə müraciət etsinlər.

### КРЕМЪ НЕЛЛИ
### NELLÜ'S CREAM
### KREM NELLİ

İngilis zadəganları sairlərindən ziyadə bu Krem Nelli işlədirlər. Qolun, vücudun dərisini ağardıb yumşaltmaq üçün hər il Londonda bir milyon banka satılır. Krem Nelli insanın üzündə olan ləkələri təmizləyir. Satılır Murmalizdo, Getlinsx, Qrafmans və kompaniyası və cümlə apteka və aptekarski dükanlarda. Bir şüşə alıb nümuş etmək olar. Şüşəsinin qiyməti 1 manat 25 qəpik və 2 manat 25 qəpik. Naloj ilə göndərilsə, 50 qəpik artıqdır. Külli Rusiya üçün adres: Moskvada Priçistinka, Vasilevski pereulok, 3 nömrəli ev.




– A Kəblə Cəfərəli, məbada xəyalına özgə şeylər gətirəsən, bu əməllər hamısı müsəlmandan qalmadır ha...

8 zilqədə 1328 **Beşimci il** 30 ноября 1910 г.

# ملا نصرالدين

№38 Qiyməti 12 qəpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 k. № 38



Litoq. S.Bıxova.

Osmanlının Germaniyadan borc alması.

## ƏDƏBİYYAT

### QUMARIN LƏZZƏTİ

Kim deyir artıq deyil meydən qumarın ləzzəti?
Ya səfabəxşa deyil bu zəhrimarın ləzzəti?
Udsa da, uddursa da var bu şüarın ləzzəti,
Yox, buna olmaz əvəz hər işvəkarın ləzzəti,
Getməyir əsla damağımdan qumarın ləzzəti.

Oldu vəqta ki, mühəyya məclisi-«vertuşka», «bank»,
Ortalıq filfövr pul ilə dolur zanqa-zaranq.
Gah gəlir, gahi gedir, axırda qalmır bir franq,
Onda gəl gör, dadlıdır bu, ya xumarın ləzzəti?
Getməyir əsla damağımdan qumarın ləzzəti.



Bircə saatda hərifin «dördünü» nabud edir,
Kisəni simü zər ilə doldurub xoşnud edir,
Kim ki, bu söydadadır, minlərlə ildə sud edir,
Bir belə nəfi olur nə ehtikarın ləzzəti,
Getməyir əsla damağımdan qumarın ləzzəti.

Bax, bu sənətdən özüm mən bir neçə mülk almışam,
Həm qızıl saat, sepoçka, çərkəzi börk almışam,
Bir dənə zərrin kəmər, astarı xəz kürk almışam.
Hansı baqqalında var bu bəxtiyarın ləzzəti,
Getməyir əsla damağımdan qumarın ləzzəti.



Gah olur it tək hürür bir dəfə yoldaşın əli,
Boş qalır başım kimi, bir dəmdə yoldaşın əli,
On verir, beş verməli ikən bu çaşbaşın əli.
Keflidə hərgiz tapılmaz bədqumarın ləzzəti,
Getməyir əsla damağımdan qumarın ləzzəti.

Ləzzəti yox udmanın, var ləzzəti uddurmanın,
Titrəmə, öskürmə bir yanda, ocaqdır bir yanın.
Əsnəmə, gərnəşmə əl çəkməz, çıxır guya canın.
Hansı pünhanındadır bu aşikarın ləzzəti?!
Getməyir əsla damağımdan qumarın ləzzəti.



Gəncədə yaxşı tərəqqidə qumarbazın işi,
Qış gecə-gündüz görülsün beş yayın, yazın işi,
Kirli pul yazım, deyil amma azın-mazın işi.
Xalları ovcumdadır, var bunda varın ləzzəti,
Getməyir əsla damağımdan qumarın ləzzəti.

*Kefsiz*

---

## TƏBRİZ XƏBƏRLƏRİ

Bu gün üç gündür ki, Təbriz şəhərinin küçə və bazarların gəzib tamaşa edirəm. Tamaşalı və təəccüblü işlərdən biri budur ki, beş-altı yaşından on üç-on dörd yaşına çatmış gül parçası kimi uşaqlar küçə və bazarlarda və erməni məhəlləsində gəzib dilənçilik edirlər.

İndi əgər soruşsanız ki, islamiyyət dərdi çəkən, vətənpərəst və hürriyyət qəhrəmanları necə olurlar, iltifat etsəniz, xidmətinizə ərz etməyə hazıram.

Bəli, o ki, ruhanilərdən özlərini lap islamiyyəpərəst və məşrutə tərəfdarı hesab edib gözə soxulanlardan birisi Siqqətül-islam cənablarıdır, küçə və bazara çıxmır ki, bu işləri də görə. Çünki bu büzürgüvar təksiri-islama qaildir, namusi-islama qail deyil. Necə ki, biçarə rus qazağını çox zəhmət və məşəqqət ilə xətnə edib islama daxil elədi.

Birisi də cənab həzrət Hacı Seyidəl-mühəqqiqindir. O da ona görə eşiyə çıxmır ki, namusi-islama qail deyil. Və bir də bu günlərdə onun başı çox qarışıqdır. Bu günə işləri ondan gözləmək olmaz. Çünki həmi Əncüməndən salıblar eşiyə, ovqatı çox təlxdir, həm də arvadının köhnəlməyindən naşi təzə bir arvad alıbdır.

O ki, qaldı hürriyyət qəhrəmanları, onların da bir neçəsi xalqı çəkib çalıb-çapıb gedib oturublar Tehranda, başlayıblar «va şəriata» naləsi çəkməyə. Bəziləri də idarələrə soxulub pul toplamağa məşğuldur. Birisi də Urumidə, Xoyda və Səlmasda elədiyi qarətlərə qane olmayıb, Qaradağda nə qədər quldur, çapovulçu və millətə güllə atan varsa, yığıb başına, adların qoyub atlı sərbaz, özü də olub rəisi-nəzmiyyə və deyir nə qədər bunların əlində qarəti millət malı var və hamısının məvacibi mənə yetişər. Çünki mən hürriyyət pəhləvanıyam, özüm də göyçək uşaqlar ilə kef çəkməyə məşğul olaram. Millətin balaları dilənməsin ki, lap acından ölsün, mənə görə nə var?

O ki, Əncümən və əyalətdir, o da hamıya aşkara məlumdur ki, nə qayırırlar. O fədailərin bəziləri gah Yevropada və gah İranda özlərinə nüfuz və rəyasət qazanmağa məşğuldurlar. Əsnaf və kəsəbəyə gəldikdə bir az çəkməz rüəsayi-millətin dövlətindən və ruhanilərin duasının bərəkətindən əhlü əyallarının qolundan tutub o biri yolçulara mülhəq olarlar. Yaşasın bu millətin pişrövləri və İran parlamentinin üzvləri!!!

Qalan səyahətlərimi sora yazaram.

*Gələn-gedən*

---

## AŞQABAD XƏBƏRLƏRİ

Aşqabadın kursu bu il çox xoş keçir. Müsəlman çayçıxanalarında qrammofonlar çalınır, vertuşka, bank, qınçına, loto vurhavurdur. Pitinin, kababın, bozbaşın, kəlləpaçanın iyi aləmi müəttər və xalqı bihuş eləyir. Nağılar quldur Rəhim xandan, Molla Qivamdan, Hacı Molla Babadan və rövzəpəz Əbdüləlidən elə nağıllar və elə möcüzələr danışırlar ki, adam heyran qalır. Yusif sifətli, Davud səsli, Zəkəriyya boylu dərvişlər bülbül kimi cəh-cəh vururlar. Çolaq dərviş bu zənguləni vurub qurtarınca samein bir partiya lotoya «dovolna» deyirlər. Qərəz, nə başını ağrıdım, bir qiyamət-fısqırıq var ki, lap bakılıların Bibiheybət ziyarətinə oxşayır.

*İmza: Davut xanı*

---

## MƏRHUM MÜƏLLİM NACİ HƏZRƏTLƏRİNƏ BƏNZƏTMƏ

Ariflər edər odlara düşmüş kimi nalə,
Ziri-şəfədən molla edər xəndə bu halə.
Pabənd eləmiş bizləri təqlid ilə molla,
Bir dəm buraxırmı gedəlim kəsbü kəmalə?
Təqsimi-əzəldə düşüb alimlərə cənnət,
Oldur ki, yazır Molla Cəfər kupçi, qəbalə.
İslamda da aya bulunurmu aranılsa,
Bir molla ki, meyl eyləməyə pul ilə malə?!
Alim ona derlər kim edə milləti islah
Tədric ilə zatındakı nöqsanı, izalə.
Yoxsa ola daim işi həp xəlqə təməllüq,
Min-min sata bu milləti bir nöğrə medalə.
Həp ömrünü ürfana çalış, əhli-qüyur ol,
Mən fazili-əsrəm – deyərək yazma risalə.
İstər isək etmək füqəra milləti dilşad,
Övladlarını uşqolaya eylə həvalə.
Ey badi-səba, uğragilən Tiflis ərayə,
Təzim elə Lağlağıya, Hərdəmxəyalə.
Qürbətdə nələr çəkdiyini aşiqi-zarın
Ərz eylə kəmal ilə, cavab al bu sualə.

*Aşqabad,*
*Xortdan bəy*

---

## SUALLAR

Bir şəxs on üç ay bir məmləkətdə fərmanfərmalıq eləyə və hər qisim ixtiyarat onun əlinə verilə, genə bir iş bacarmaya, aya, belə şəxs mənsəbini buraxıb istefa versə nə olar?

---

Bəzi əşxas iki-üç heyz-nifas məsələsi öyrənələr və peşələri də haman məsələləri minbərlərdə demək ola, axırda cahil millət də o cənabları vəkil seçələr, sora onlar Əncümən vəkalətindən istefa verib desələr ki, bu bizim işimiz deyil, nə olar?

---

Birisi məktəbdarlıqdan başqa, o birisi təlis satmaqdan, bir qeyrisi aşpazlıqdan, biri də qab dibi yalamaqdan başqa bir iş bacarmaya, avam camaat da bunları özlərinə dadxah hesab edib Əncüməndə oturdalar ki, bunlara həm behişt qazanalar və həm də məmləkəti idarə edələr, bunlar da behişt və qeyrisinin əvəzində məzlum millətin altı min illik qoca bir vətənini badi-fənaya verələr, sora da başlayalar ki, biz daha vətən və millət işinə baxmırıq, çünki bizim xidmətlərimiz vətənin ayağına balta çalmaqdır, onda görəsən nə olar?

---

Əgər bir şəxs ömrünün əvvəllində heç bilməyə ki, sərbaz dünyada arşın ilə ölçülür və ya batman ilə çəkilir, o adamı zornan gətirib rəis eləyirlər, sora o adam deyə




– Həştərxanda qərq olub ölən neçə nəfərdir?
– Danışıqlara görə 300 nəfərdən artıqdır.
– Canım, neçə vəqt idi bir qəpik gəlir yox idi. Mağıl mədaxil yolu açıldı.
– Bəs necə, bu gün Merkurinin agenti 3 dəfə mənim dalımca adam göndərib.




— Ay ata, vallah alim, billah alim, ancaq sən mənə bir müsəlman qızı göstər ki, təhəri-töhüri adama oxşasın, söz qansın, söz qandırsın, vallah alım.

## Kərbəlada təhsil




Elmi-heyətdən: Göyün əvvəlinci təbəqəsi nöğreyi-xamdandır.

ki, «baba, rəyasət mənim işim deyil, mənim üçün doxsan doqquz əl lazımdır ki, öz başımı saxlayım», görəsən bunda nə olar?

---

İranda məhərrəmlikdə qəndə, çaya, qara libaslara, növhəxanlara və qanlı köynəklərə, aşura gecəsi şama və şirniyə verilən pulları və iki milyon da müstəhəbbi ziyarət pullarını üstünə artırıb, fəqir və məsum uşaqları küçələrdən yığıb məktəblərdə oxutsalar, nə olar?

---

Görəsən bu bədbəxt millət gözlərini açıb, düşmənlərini dürüst tanıyıb, bir neçə vaxta mollakeşlik etsələr, nə olar?

---

İranda lotubazlığın adın partibazlıq qoymayıb dəstəbazlıq desələr, nə olar?

---

Bikarlar mücahidliyi özlərinə mayəsiz sənət hesab etməyib, milləti asudə buraxıb, öz qədim işlərinə getsələr, qiyamətmi qopar?

---

Nəcəf üləması həştad yaşa yetişəndən sora politika işlərinə qarışmağı özlərinə şöhrət bilməyib, ancaq xüms və zəkat alıb risalələrin yazsalar, olmazmı?

---

Beş-altı nəfər Azərbaycan vəkilləri məclisə soxulmaqdan ötrü İranı bir-birinə vurmayıb, məzlum millətin vətənini pay-püşk olmağa səbəb olmaqdan çəkinsələr, nə olar?

---

Bəzi adlarını «vətənxah» və «millətpərəst» qoyub inqilabda Firəngistana qaçıb kef çəkənlər və asudəlik zamanı İrana qayıdıb xoruzlananlar genə Firəngistana qayıdıb işrətə məşğul olsalar, görəsən nə olar?

*İmza: heç zad olmaz*

## MƏŞĞƏLƏ

Hər kəs ki, bikardır və özü də bilmir ki, nə qayırsın, məsləhət budur ki, qışın bu uzun gecələri «Zadülməad» kitabını açsın qabağına və başlayıb bu rəvayəti oxuyub əməl etsin:

«Bəd əz-fərizeye zohr do rokət namaz bekon behər surət ke xahi və bəd əz-an səd mərtəbe bequ: Ya qaziyəlhəvayc əttalibin. Və həşt rokət nafileye-əsrra ba adab beca miyavəri və dər bəzi rəvayət vared şode əst ke dər hər rokət əz-nafile-ye-əsr bəd əz həmd se mərtəbe «Qolhovəllahu əhəd» və yek mərtəbə «inna ətinak əl kosərə» bexan və dər rəvayəte degər vared şodeəst ke dər ruye həsire pakize benişin və səd mərtəbe «sureyi-həmd» və səd mərtəbe «qülhüvəllah» və dəh mərtəbe «ayətəl-korsi» bexan».

Hər kəs bu rəvayətə əməl eləyə, dünyada ayrı işə məşğul olmağa ehtiyacı olmaz.

*Danabaş*

---

## QAFQAZ XƏBƏRLƏRİ

Ordubad – Eşitdiyimə görə Qurban bayramının günü Ordubad müsəlman dram cəmiyyəti neçə il bundan qabaq açılmış qız məktəbinin nəfinə əvvəlinci dəfə olaraq təzə qələmdən çıxmış «Hüseyn Kürd» operasını mövqeyi-tamaşaya qoyacaqdır. Biletlər satılmaqdadır. Kassanın qabağında iynə salmağa yer yoxdur. Afərin ordubadlıların belə zorba himmətinə!..

Və bir də lazım bilirik teatra gələn zatlara xəbər verək ki, Hüseyn Kürd su içmək istəyəndə quyunun qırağından yapışıb başına çəkən vaxt gözlərini yumsunlar ki, toz dolmasın.

***

**İran parlamentində Hacı Seyid Nəsrullahın nitqi:**

Ağalar, əcnəbi qoşunlarının İrandan çıxmaq barəsində olan sizin təşviş və kuşişinizi bizim partiya tamam əbəs hesab edir. Ondan ötrü ki, əgər biz müsəlman olsaq, gərək bilək ki, İran bisahib deyil. Bu gündür, sabahdır, lap intəhası məhərrəməcən bir göy atlı və yaşıl ələmli peyda olub kafirlərin toxumunu İrandan kəsər.

---

## GENƏ DƏRVİŞLƏR!!!

Bizə yetişən xəbərlərə görə bu saat İranın hər nöqtəsində, xüsusən Təbrizdə dərvişlər hər gün qurduqları mərəkələrdən yığdıqları pulların 20 prosentini özlərinə çıxıb, qalanını Həştərxanda qraf olan üç yüz iranlı hammalların uşaqlarına ianə yığmaq üçün Təbrizdə təşkil olunan cəmiyyətə verirlər.

*Gözüylə görən*

---

## DƏYƏNƏK

Ətəbata çağırıblar ki, Sipehdarı gedib
Əvəzindən hamının rövzədə zəvvar olsun.

Pul verib şiələrin ta satın alsın qanını,
Gəlsin İranda otursun, daha xunxar olsun.

*Cüvəllağı*

---

## ALLAH BƏNDƏLƏRİ

Hörmətli Molla Nəsrəddin əmi çoxdandır ki, bu keçəl və tənbəl bitli-sirkəli musurmanlardan bixəbər olub bilməmisən ki, bu müddətdə bu tiryəki və bəngi qardaşlar necə gözəl iqdamatlar eləyiblər və necə hamamlarda başların tər-təmiz mərmər kimi qırxdırıb qarpıza oxşadıblar və necə rəngə, hənaya doyunca yatıblar və bəzi savab işlərin dalısınca necə şövqü həvəs ilə gediblər.

Əlhəmdülillah hər yerdə səkkiz yaşında qızları ərə vermək, hər beşdə-üçdə savabından ötrü bir siğə etmək, hər şəhərdə köhnə arvadlara talağ verib təzə əyal ixtiyar etmək hökmfərmadır. Şeyximizin başı bir dəqiqə ayıq deyil ki, qəzet oxusun. Hey talağdı verir, kəbindi kəsir, siğədi oxuyur. Burada şairin bu şeri münasibi-hal göründü:

Zəki tazə kon mövsim hər bəhar
Ki təqvimi-köhnə nəyayəd bekar.*

Maşallah bu il Kərbəla və Xorasan zəvvarının hədi-hesabı yoxdu. Hey cənazəndi ki, qaçaq və oğruluq ilə o taya keçirlər və hey ölü sümüyüdü ki, at və eşşək torbasında daşıyırlar. Allah əcr versin. Hətta Mirzə ... adlı bir nadirülvücud öz qayınatasını ki, il yarım idi mərhum olmuşdu, qəbrdən çıxardıb, yaş olduğuna görə gün qabağında qurudub Kərbəlaya apardı. Allah bəndəsi arvadın natariusa aparıb yüzə on beş prosent ilə borc elətdirdi, razı olmadı ki, biçarə ölü qəbrdə nigaran və narahat olsun. Xudavəndi-aləm bu cür mömin və müqəddəs kişiləri bizim içimizdən əskik eləməsin. Yoxsa bu əməllər ki, bizdə var, başımıza göydən daş yağar. Belə ki, yeddi-səkkiz ay idi bir qətrə yağış düşmürdü (və necə ki, molla Mədigov Pirxamuş məscidində öz zəbani-möcüzbəyanı ilə buyurdu) bizim günahlarımız Allahın rəhmət dəryasının qabağını kəsib qoymurdu bir qətrə yağış yerə düşsün. Məhz bu dindar və pak vücudların bərəkətindən və elədikləri xeyir əməllərin nəticəsindən xudavəndi-aləmin bizə rəhmi gəlib, indi hey yağışdı ki, yağır.

Allah öz birliyi xatirinə cəmi mömin və müsəlman qardaşların ziyarətlərini qəbul edib dübarə, səbarə qismət eləsin. O cümlədən biz üzüqaraya da. Amin, ya rəbbül-aləmin!

*O taylı*

## TƏZƏ MƏSƏLƏ

Salyan vaizi Kərbəlayi Hacı Molla Hüseynqulu müvzəpəz podrata götürdüyü məsciddə hərdənbir mənbərə çıxıb bir para məsələlər həll eliyir. İndi neçə vaxtdır ki, bir təzə məsələ də başlayıb ta hal həll olunub qurtarmır. Bu kəbleyi diyir ki, «camaat, ittihad, ittifaq və qeyri şeylər çox gözəl işdir, amma biz milləti-islama yaraşmaz». (Bax gör nə gözəl diyir zalım oğlu). Zəhmət əziyyət lazım deyil. Biz müsəlmanların işi keçib. Bundan belə çalışmağa gəlməz. Bu işlər qalıb Sahibəzzamanın zühurundan soraya ki, o cənabın qılıncıyla düzələcəkdir.

*İmza: Etiqadı möhkəm*

---

## TƏHLƏ KƏNDİNDƏ MƏŞƏDİ QASIM

Məşədi Qasım əmi dünyada təkdir – desəm, hamı mənə güləcək. Vallah, billah, zəmanə bu kişinin mislini nə yetirib, nə də yetirəcək. Bu Məşədi Qasım əminin bir həmkəndlisi var, adı Məşədi Murad xandır. Bu Məşədi Murad xan bu axır vaxtlarda kasıb düşmüşdü. Ancaq beş min manata dəyən bir evi var idi. İstəyirdi ki, sökübdağıtsın, təzə, bir on min manata dəyən imarət saldırsın. Ancaq pulu yox idi ki, fəhlə tutub evi sökdürsün. Məşədi Qasım əmiyə də iki yüz manat borcu var idi. Məşədi Qasım əmi bu kişinin halını nəzərdə tutub, öz qohum-əqrəbasına hökm eləyib evi kökündən sökdürdü və daşını, ağacını daşıtdırdı öz qapısına. Məşədi Murad xan da öz balalarının qolundan yapışıb kəndin bir tərəfində çadır qurub oturdu. Bu qışı orada keçirəcəklər. İnşallah, yaz açılanda Məşədi Qasım əminin köməyilə təzə evin tikilməyi başlanacaqdır.

*Bacadan baxan*

***Müvəqqəti müdir: Məhəmmədəli Sidqizadə***

## TƏSHİH

Keçən 37-ci nömrəmizin 2-ci səhifəsində olan şəkilin altında «Nəcəf müctəhidləri» səhvən «Təbriz müctəhidləri» yazılmışdır. Qarelərdən üzr istəyiriz.

*İdarə*

## ELANLAR



---

* Tərcüməsi: Zəki, hər bahar mövsümü təzələ ki, köhnə təqvim işə yaramaz. *(Red. – T.K.)*




İran parlamentində natiq Hacı Seyid Nəsrullah.
(Nitqin surəti həmin nömrədə).

17 zilhiccə 1328 **Beşimci il** 8 декабря 1910 г.

# ملا نصر الدین

№39 Qiyməti 12 qəpik.

# МОЛЛА НАСРЕДДИНЪ

Цена 12 k. № 39




Litoq S.Bıxova

Bilirsiniz nə var? Bu gecə mən Şah Abbası yuxuda görmüşəm.

## ƏDƏBİYYAT

Sizə nə Mol[*] dayı kim, mən gəzirəm şəhrləri,
Paraxodlar minirəm, seyr edirəm bəhrləri,
Gah Dəryayi-siyahı, gah ufaq nəhrləri,
Ya ki, can hərləyirəm, yox işimin təhrləri?
Pul mənimdir sizə nə dəxli ki, mən paylayıram,
Saratov qızlarını qəsrdə mehmanlayıram?

Yazmısan çox dəfəat ilə ki, biaram mən,
Gəzirəm Rusiyanı, aşiqi-didaram mən,
Xubru axtarıram, bəs ki, xiridaram mən.
Nə edim bəs, a kişi? Dərdə giriftaram mən.
Var ikən fürsətim əldə beçəbazlıq edirəm,
Ali Qacar qoyan yoldu tutub mən gedirəm.

Yazma kim, şəhrlərim məzbələdir, ya ki, kəsif,
Millətim həpsi fəqir, cümləsi bimarü xərif.
Bavər etmə, neçə şəhrim var, əmi, xeyli lətif,
Carco, Girmana və xassə Buxarayi-şərif.
Bu şəhərlərdə neçə Anna ilən «tans» edirəm
O mənə yox, mən ona qaç dəfə «reverans» edirəm.

Dəm qənimətdi, canım, əsrimiz indi pis olub,
Pəzəvəng Məmmədəli zülm ilə Reydən qovulub.
O həpənd usta Həmid zindana, həbsə soxulub,
Portuğalda, nə bilim, məclisi-cümhur qurulub.
Görürəm növbə mənə çatdı, bunu mən qanıram,
Gələcək günlərimi fikr eləyib odlanıram.

Harda var nazlı beçə xadimi-dərbar edirəm,
Qazi də izn verir, zor ilə biar edirəm,
Sora bir çin də verib millətə sərdar edirəm,
Səs çıxarsa atası, həbsə giriftar edirəm.



*Molla – (*Red.*)

Döydürüb söydürürəm, zindana da saldırıram,
Bəzisin basdırıram, bəzisini asdırıram.

---

Keçən il fitnəli söz ortalığa atdırdım,
Şiəni sünnülərə zülm ilə doğratdırdım,
Sünnünü şiələrə çoxluca taptatdırdım,
Bu sayaq ilə ümumun başını qatdırdım,
Əkrəmüs zeyfi* dəxi seyflərə qandırtdım.

---

Öldürüb özlərini, mallarını yandırtdım.
Məsləhət şimdi budur, Molla, dəxi fikr eləmə,
Bu politikanı bilib rəiyyətimə zikr eləmə.

*Xortdan bəy*

---

## ZABRATDAN

Mübarək Axund Mirhəbib ağa ilə Molla Abidin cənabları Zabrat camaatının fəlakətzədə halını nəzərə alıb himmət qayışını bellərinə bağlayıb, Zabrat kəndində müsəlman dilində «Təharət» adında bir qəzet verməkdən ötrü hökumətə ərizə verib izn hasil etdilər. Qəzetin ümdə məqsədi camaata üsuli-cədid üzrə açılan məktəblərin nəfini, camaatı təlim-tərbiyə barəsində gözəl iqdamatlara həvəsləndirməyi, bir para şəri məsələlərdən, məsələn, heyz, nifas, həcəmət və təqliddən bəhs edib, təzə ərsəyə gələn saqqalsız cavanların laməzhəb və bidin olmalarını və sair bu tövr siyasi və fənni məqalələr yazıb nəşr etmək olacaqdır.

Dünən həmin bu fövqəzzikr zatlar «Ədəb» məktəbinə gəlib, şagirdlərin dərslərinə qulaq asıb, uşaqların gözəl-gözəl cavab vermələri axundların artıq xoşuna gəldiyindən öz kiseyi-fütüvvətlərindən hər uşağa bir əba və bir əmmamə almaq üçün bir məbləğ ehsan buyurdular. Təəccüb budur ki, bu cənabların bu tövr himmətlərinin və belə gözəl iqdamatlarının əvəzində «Günəş» qəzetində Novruzəli Hacı Xəlil oğlu sütun yarım bir əhvalat yazıb bu mollaları biabru edir.

Novruzəli Hacı Xəlil oğluna çox ayıb ola!..

*Bambılı*

---

## DOĞRU YUXU

Keçənlərdə bir gecə Ərəszadə yatıb yuxuda mərhum Şah Abbası görür. Şah buna deyir ki, molla heç razı deyil ki, mən qoyduğum mövqufatdan məktəb təmiratına xərc olunsun. Çalışın ərizələr verin ki, mənim pullarım necə var elə də qalsın bankda.

Ərəszadə cənabları da yuxuda belə cavab verir ki, qibleyi-aləm, mənim də təsəvvürüm budur. Bu vaqeəyə iki nəfər də şahid var.

*Qızdırmalı*

---

## QAFQAZ XƏBƏRLƏRİ

Ordubad – Vənənd kəndindən bu axır günlərdə həyəcanlı xəbərlər gəlməkdədir. Axund Molla Məhəmmədbağırın möhkəmisindən bir çox lazımlı şeylər oğurlanıbdır. O cümlədən axundun iki yüz bağlı məhəbbət duasını oğurlayıblar. Buna cəhət arvadlar ərləri ilə yola getməyib boşanmağa hazırlaşırlar. Çünki dualar oğurlanandan məhəbbət və məvəddət qət olmuşdür. Bundan əlavə axundun «Cameüd-dəvat» kitabı oğurlandığı üçün bir çox körpə uşaqlara həmzad yeli dəyib və şəhərin müxtəlif yerlərində cin, şəyatin görünür. Axund kəndə on günlük ultimatum vermiş. Əgər on günə kimi şeylər tapılmasa, axundun hökmü ilə cinlər kəndi atəşə tutacaqlar.

---

Naxçıvan – Məhərrəm ayı yaxınlaşdığından Naxçıvan mərsiyəxanlarından bir nəfəri qabaq dişlərindən birini bir mahir dəlləyə verib çəkdirmişdir. Çünki minbərdə Segah zəngulәsi vurmaq üçün qabaq diş mane olur.

---

Dünən haman təzə sayaq ilə oxumağın rəsmi-iftitahı mədrəsədə cənab...... n hüzurunda başa gəldi. Axundu hər tərəfdən alqışladılar, xüsusən məscid dükanlarında olan baqqal cərgəsi.

---

Culfa – Bura qəstinsalarında İran çinovnikləri üçün kredit açıldı. Bu şərtlə ki, uniformaları üstlərində olsun.

---

Vənənd – Axund möhkəmisindən oğurlanmış məhəbbət duaları Vyana polisəsi tərəfindən axtarılıb, orada çoxdan bəri müsafir olan Kəblə Məmmədəlinin torbasında tutulmuşdur. Məzkurun xəyalı haman duaları suya yuyub İranın təzə naibüssəltənəsi Nasirülmülkə içirtmək imiş ki, bəlkə ona İranda, heç olmasa, bir fərraşbaşılıq mənsəbi tapılsın.

---

Culfa – İranın gömrüyünün təhvildar kassirinin dörd min tümənə qədər pulunu aparan rus qızlarını dərdəst etmək üçün gömrüyün baş fərraşı Rusiyaya hərəkət etdi.

---

## AŞQABADDAKI AĞA!!!

Sən Allah, bəsdi. Sən pirin, bəsdi. Yəni o qədər eləyəcəksən ki, axırda işlərin üstün lap açacaqlar. Bircə Şamaxını yadına salsana. Axır, bəs deyil? Vallah, axırda səndən bir para məsələlər soruşaram, lap mat qalarsan ki, bu Molla bu məsələləri hardan bilir. Mən də soruşmasam, özgələri soruşarlar. Birdən birisi səndən soruşar ki: Cənab Ağa! Şamaxıda o övrət ki, tövbə edib gəldi girdi

---

*Əkrəmüz-Zeyf vəlo kanə kafira.
**Qonaq kafir də olsa, hörmət elə (hədis). – (Red. – T.K.)




Bir şəhərdə bir konsulxana əmələcatı.
(Təfsili həmin nömrədə.)

sizin evə, sora nə oldu ki, sizdən qaçıb fahişəxanada lotu-potuya pənah apardı? A kişi, daha bəs deyilmi? Təzə dediklərini mənə yazmışdılar, nə fayda ki, kağızı itirmişəm, əhvalat da yadımdan çıxıb, xoşbəxt olduq.

*Cəməri*

---

**«Günəş»in 70-ci nömrəsindəki taziyanəyə cavab:**

Osmanlı dili çünki lisani-ədəbidir,
Oldur ki, ... onu anlaya bilməz.
Yoxsa onu «türkə eləmək tərcümə» ləfzi
Məntiqlə qələtdir, belə şey heç ola bilməz.

*Füzul*

---

## RƏHİM XAN KÜSÜBMÜŞ

Tehrandan hökumət tərəfindən bu günlər Tiflisə bir fərəhəfza teleqram gəlib, teleqramın məzmunu budur ki: «Bir növ Rəhim xandan soruşulsun görək ki, niyə bizdən küsüb gedib. Əgər mümkün isə, biz ilə sülh etsin». Bu teleqram yetişcək Tiflisdən məxsus bir xan göndərilib ki, gedib görsün Rəhim xan bizdən niyə «küsüb». İndi biz nə eləyək ki, biz ilə barışsın?

İdarədən: Qəbrin çatlasın – Hacı Molla Məhəmmədəli dedi: «Baba baron Diqran m m m mən ölüm, mən nə deyim ki, erməni olum...»

*Soyuq*

---

## BİR KONSULXANADA MİRZƏ İLƏ AŞPAZ

M. – A balam, bu qədər adama bu plovdan nə olacaq?

A. – Cənab Mirzə, bulku da var da.

M. – Laməhalə bulkunu bir az çox alaydın.

A. – Siz ki, Rəştdə çox olmusunuz, bilmirsiz ki, çox çörək yemək adamı öldürər?

M. – A xanəxarab, Rəştdə çörək çox yeməzlər, düyü yeyərlər, di barı düyünü çox tökəydin.

A. – Beş adama bundan çox düyü olar?

M. – Adə, nə axmaq danışırsan, burda beş adam var?

A. – Mən demədim ki, beş adam var. Mən deyirəm ki, xörək beş adam üçün bişib, mən beş adama xörək bişirmək danışmışam, indi hər gün buraya bu qədər əngəl yığılır, mənim taxsırım nədir?

M. – Doğru deyirlərmiş: ağanın malı gedir, nökərin canı. Adə, xanın düyüsü bir az artıq getsə, ya on beş adama bir bulku yerinə beş bulku alsan, canın çıxar?

A. – Canım çıxmaz, amma mənə zərər olar.

M. – Necə yanı, xan pulun verməz?

A. – O verməz, mən də istəmərəm.

M. – Nə danışırsan adə, neyçün istəmirsən?

A. – Ona görə ki, buranın naharını mən xandan icarəyə götürmüşəm. Gündə beş manata. Daha mənim nə haqqım var xandan artıq pul istəyim?

M. – Necə, necə? Naharı icarəyə götürmüsən?

A. – Bəli, icarəyə götürmüşəm.

M. – Hə... belə deyinən də!.. Çox əcəb, çox əcəb... Xub, o ki, deyirsən beş adam danışmışam, a nainsaf, beş adama elə bu qədər xörək verəcəksən, o da gündə beş manata?

A. – Cənab Mirzə, səhv etməyin, əndərun, birun adamları, faytonçu, nökər, qorniçnə, gələn qonaqlar və mən özüm, nə başını ağradım, elə gün olur ki, qırx adama yemək verirəm.

M. – A balam, onda gərək sən gündə on manat da cibindən zərər qoyasan!

A. – Xeyr, zərər niyə? Mən gündə dörd manat xərcləyib nahar hazırlayıram, bir manat da özümə qazanc qalır. İndi istər ki, xan yüz nəfər xörək zakaz versin, elə həmən o bişmişdən veriləcək, istər hər adama bir cücə düşə.

*Lavaş*

---

## SALYANDA TƏRƏQQİ

Bu axır vaxtlarda aləmi-islamın, xüsusən Qafqazın hər nöqtəsindən müsəlmanların gözləri açılıb, qabağa getmək xəbərləri eşidilməkdədir, mən də həmişə qəzetlərə baxanda görürəm ki, Bakıda «Nəşri-maarif» cəmiyyəti xalqı işıqlandırmağa dördəlli çalışır, Gəncə «Nəşriyyat cəmiyyəti» cürbəcürə mənfəətli kitablar çap elətdirib nəşr eləyir. Tiflisdə dövlətlilər müsəlman məhəlləsində bir teatro olmadığın nəzərdə tutub teatro tikməyə hazırlaşırlar. Nə bilim filan şəhərdə qiraətxana açdılar. Nə başını ağrıdım, elə görürsən ki, hər yanda xeyirli işlərə qədəm qoyurlar. Amma heç bizim müqəddəs vətənimiz olan Salyanın adı çəkilmir. Bu iş mənim ürəyimdə bir niskil olub həmişə düşünürdüm. Çox fikir edəndən sora başlayıb bir mehmanxana açdım ki, bəlkə bir növ ilə bizim şəhərimizin adı da qəzetlərdə çəkilsin. Bundan əlavə bir xeyirli iş başlamışam ki, indiyə kimi bunun kimi gözəl və mənfəətli iş müsəlman aləmində görülməyib. Məsələn, gördüm ki, mehmanxanamıza təşrif gətirən möhtərəm qonaqlarımız çörək yeyəndən sora çox narahat olurlar, gözlərinə yuxu getmir, axırda naəlac qalıb, durub, gedib qonşu meyxanalarda keflənib, gəlib rahat yatırlar. Sora mən də qonaqların bu cür zəhmətinə və xeyiri xaçpərəstlərə verməklərinə razı olmayıb mehmanxananın içində mükəmməl bir meyxana açdım; hər cürə içkilər, ələlxüsus, yeddi illik çaxırlar mövcuddur. Ümidvaram ki, hörmətli qonaqlar xeyiri özgəsinə verməzlər.

*Mehmanxananın xozeyini*

---

## ELAN

Məhərrəmin yaxınlaşmağına görə hamı şaxsey dəstələrində zəncir vuran, baş yaran və şaxsey gedən üzvlərə məlum edirik ki, zilhiccə ayının 20-də dəstələrin idarələrində hazır olmalıdırlar ki, lazımi binagüzarlıq əmələ gəlsin. Bunu da əlavə edirik ki, hər kəs üzvlük haqqını özüylə bərabər gətirsin, əks surətdə dəstədən qovulacaqlar. Ancaq cavan və gözəl uşaqlar pulsuz da qəbul olunurlar.

*Tiflisdə şaxsey dəstələrinin sədrləri*

## AZĞUR KƏNDİNDƏN

Dünyada qəribə şeylər çox ittifaq düşür, amma mən aşağıda nağıl etdiyim əhvalat lap qəribədir. Məsələn, üç il bundan qabaq neçə nəfər nadinc şəxslər bizim camaatın arasına düşüb başladılar məktəbdən, elmdən və tərəqqidən dəm vurmağa. Bir neçə ağsaqqallar bunlara dedilər ki, qardaş, bu işlərdən əl çəkin, biz müsəlmanıq, urus dərsi və ya urus qaydası bizim nəyimizə gərək? Biçarə ata-babalarımız nə bilirdi uçitel kimdi, skamya nədi, doska nəyə deyirlər. Onların canı: həsir, ağbaş molla, üç falaqqa, zir, zəbər, vurhavur.

Olmadı, bunlar zəli kimi yapışdılar camaatın boğazından, bir para azğınlar da bunlara qoşulub işə başladılar. Bəli, bir də gördük ki, daş daşındı, ağac çəkildi, divar tikilib məktəb hazır oldu.

Hələ məktəbdən başqa, bir cəmiyyəti-xeyriyyə də düzəltdilər (cəmiyyəti-xeyriyyə gördüyü xeyir işləri də isbat etməyi özlərinə bağışladım). Bəli, indi tamam üç ildir ki, o məktəb qaralıb qalıb ortalıqda, yayda quşlar skamyaların üstündə yuva tikirlər, qışda da siçanların ümid evləridir, günlərini orada keçirib oranı tikənlərin ömürlərinə dua edirlər.

İndi birisi də yoxdur ki, bunlara desin: ay balam, doğrudan, əgər fikriniz iş görməkdir, bu cür iş görmək olmaz, yox, əgər bu da bir cür oyun isə, onda bağışlayın, qanmamışam.

Qərəz, dünyanın işlərini bir Allah bilər.

*Canbaz*

---

## TELEQRAF XƏBƏRLƏRİ

Orenburq – Məlum oldu ki, qraf L.N.Tolstoy ədiblər arasında məşhur və indiyə qədər pünhan olan «dəmir üzüyü»nü vəfatından qabaq yadigarlıq üçün «Din və məişət» məcmuəsinin idarəsinə göndərib.

---

İstanbul – Məclisi-məbusanda yunan məbuslarından Bizius «Purişkeviç naxoşluğu»na düçar olmuşdur.

---

Bakı – Məhərrəm dəstələrində balaca uşaqların dəri dərisindən qayrılan balabanlara gücləri çatmadığından uşaqların ataları yığılıb musiqi karxanasına on minə kimi balaca və yüngül balabanlar zakaz veriblər.

---

Quba – Qraf Tolstoyun vəfatı münasibəti ilə canına qəsd edən Molla Hacı Baba hələ genə naxoş yatır.

---

Xivə – Bu günlərdə buranın ruhaniləri zəmanənin tələbatını nəzərə alıb, üsuli-cədid məktəbi açılmağı və şəhərin bir para yerlərində qiraətxana bina etməyi və neçə yerdə mərizxana qayırmağı və bu gunə müsəlmanların tərəqiyyatına dair çox mətləblər müzakirə olundu. Bu işlərə başlamamışdan qabaq qət olundu ki, qabaqca ziyarətgahları, qələndərxanaları və qəbristanları remont eləsinlər.

---

## BÖYÜK BƏDBƏXTLİK

Aşqabad – Qurban bayramının axşamı fazili-şəhir Seyid Məhəmməd ağa öz evində əyləşib millətin tərəqqisi yolunda qələmə alınan kitabları mütaliə etməyə məşğul imiş. Əz-qəza çırağın nefti qurtarır, ağa nökəri çağırır ki, gedib neft alsın. Ancaq o da gedibmiş hamamdan xanımın boğçasını gətirsin. Axırda ağa naəlac qalıb neft qabını özü götürüb gedir, neft dükanına çatanda ayağı çöpə ilişib təpəsi üstə düşür mazut boşğasına. Camaat tökülüb bir növ ilə ağanı boşğadan çıxardırlar. Ancaq mazutu su ilə yuyub təmizləmək mümkün olmadığından ağanın başı hələ mazutlu qalır. Deyilməyə görə saqqalı lap vecdən çıxıb, yapıncı olmaqdan başqa bir şeyə yaramaz. Şəhər böyük həyəcandadır. Hər kəs bunun nə ilə təmizlənməyinin çarəsini bilib, tezliklə xəbər versə, ağanın qırmızısaqqal müridləri tərəfindən böyük mərhəmətə çatacaq.

*Baş mürid*

---

## DƏYƏNƏK

Bildir cümələrdə dükan açmazdı cəmaət,
Səd şükr, bu il qaldırılıbdır belə bidət.

Hər ildə müsəlman edə gər bunca tərəqqi,
Bir az keçər, aləm deyər: Əhsən belə millət.

*Cüvəllağı bəy*

***Müvəqqəti müdir: Məhəmmədəli Sidqizadə***




İran məmləkəti və qonaqları qəbul.

22 zilhiccə 1328 **Beşimci il** 14 декабря 1910 г.

# ملانصرالدين

№40 Qiyməti 12 qəpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 k. № 40

Səttar Xana və Bağır xana məvacib təyini
Назначение жалования Саттаръ хану и Багиръ хану въ Тегеране



– Muştuluğumu verin! Sənə ayda beş yüz tümən, Bağır dadaşıma da dörd yüz tümən məvacib kəsdilər.
– Mən ölüm?
– Sən öl, bu bığları qan içində görəsən.
– Ay can! Ay can!..



## ƏDƏBİYYAT
**(Füzuliyə bənzətmə)**

Ey xoş an ruz ke, bər niko bədəm kar nəbud,
Molla Nəsrəddin əmi xalqa havadar nəbud,
Etdiyim zülm dər ayineyi-izhar nəbud,
Dele-bidərde-mən əz dərd xəbərdar nəbud.
Aqibət rəşk bər asayişe-mən bord fələk,
Hərləyib gətdi mənim başıma bir gör nə kələk.

Bu yazıq canım əsiri-qəzeti-Molla şod,
Əməlim pişgəhi-çeşmi-həmə dünya şod,
İşlərim dər nəzəri-xəlqi-cahan peyda şod,
Mən ilə millət arasında bəsi qovğa şod,
Zalimü müfsidü mühtal çü didənd məra,
Həme dər silsileyi-zəbt-kəşidənd məra.

Moddəti keyf dər in saheye-donya kərdəm,
Dəmi-təzvir ilə əsbabi-mühəyya kərdəm,
Bəhre-xod simo zəro pul təmənna kərdəm,
Daştəm rahəte del değ-değə peyda kərdəm.
«Molla» peyda şodo qoftən ke rəfiqe-to mənəm,
Ataş əfkənd qəzetəş həm be delo cano tənəm.

Dər əcəb atəşi əndaxt beyek bar məra,
Çəkdi məcmuədə həm surəti-murdar məra.
Yazdı xasiyyətimi cümleyi-ətvar məra,
Tökdü xuni-cigər əz-dideyi-xunbar məra.
Mişəvəd şaddel be del azariye-mən,
Hiç kəs rəhm eləmirlər begiriftariye-mən.

Faş çün oldu işim ruy ze mən ponhan kərd,
Zülmha bər məne-avareye-sərgərdan kərd.
Zəfəranlı plova, həm kababa heyran kərd,
Çe konəm çareye-mən çist səraviran kərd,
Duş əz pərdeye-namus berun oftadəm,
Yaftəm «Molla»nı in raz bər u boqşadəm.

Key del azare-mən azordeyi-azar qəmət,
Qamətim yay olub əz-bare-bəlaye-sitəmət,
Nə qədər səbr eləyim mən sitəmi-dəmbədəmət,
Qalmayıb məndə dəxi taqəti-bari-ələmət.
Qoft ma şaire əsrim zema mədh məcuy,
Soxənira ke bər ma nətəvan qoft məquy.

Qoftəm ey saqqalı ağ, qəddi vəsət mərdümazar,
Maile-zolm məşo cour məkon bər məne-zar,
Bəsdi, incitmə, kişi, etmə bu məxluqi bezar,
Tez olar kim, qəzetindən belə qalmaz asar.
Mollalar təkfir edər hökm verər sərdarət
Jurnalın bağlı qalar, sərd şəvəd bazarət.

---

Nə qədər vəz elədim bər dele u kar nəkərd,
Tərke-azare-məne-zare-giriftar nəkərd,
Nə edim, rəhm mənə piri-sitəmkar nəkərd,
Məsləke-xod begereft monkere-ətvar nəkərd.
Hey dəmadəm tökürəm su yerinə gözdən qan,
Ağlayıb, seyhə çəkib eyləyirəm ahü fəğan.

*Xortdan bəy*

---

## YAXŞI ADAM

Kərbəlayı Səfər əmi çox yaxşı adamdır. Ağa Seyid Heydər də çox-çox yaxşı adamdır. Hacı Vahib və Ağa Seyid Mirzə Hüseyn də lap bimisil adamlardır. Necə həlim, necə mehriban, necə səxavətli. Heç bir kəslən işləri yoxdur, ömürlərində bir adam onlardan inciməyib (?)

Yəqin belə sözləri müsəlman milləti çox eşidib və çox da bizim millətin arasında belə sözlər mütədavildir. Hamı müsəlman şəhərlərində dumalara və ya özgə cəmiyyətlərə adam seçəndə bu sifətlərdə adamlar axtarıb, belə yaxşı adamlar seçiblər.

Hətta İran parlamentinə də elə belə yaxşı mütədəyyin, həlim mehriban və səxavətli adamlar seçilibdir. Odur ki, Səttar xana beş yüz tümən, Bağır xana dörd yüz tümən ayda məvacib kəsilib. İngilis vəzirlərinin məvacibi qədər.

Bizim Qafqazda da bir kəndə koxa, bir məhəlləyə ağsaqqal, bir uyezdə qazi, bir ölkəyə müfti və ya şeyxülislam da intixab edəndə belə adamlar axtarırlar. Və bir nəfəri tərif edəndə də bu sifətlər ilə tərif edib, onu bacaran qədər qazi ya müfti, ya şeyxülislam etməyə çalışırlar.

Vaqeən elə belə də gərək ola. Bizim təzə şeyxülislam da elə bu adamlardandır: əmin, xoşxülq, xoşsima, mehriban. Hətta köhnə fikirli alimlərin ziddinə gedir. Üsuli-cədid tərəfdarı, millət balalarının, istər qız, istər oğlan iqtizayi-zamana görə təlim və tərbiyələrinin tərəfdarıdır. Və bacardığı qədər də bu barələrdə çalışanlardandır. Müxtəsəri-kəlam, yaxşılığına heç söz yoxdur. Amma gərək elə bir tək «yaxşı» adam bizə və bizim rəsiyimizə kifayət edərmi? Yuxarıda zikr olunan yaxşı sifətlərlə dörd-beş milyon müsəlmanı və onların işlərini idarə etmək olarmı? Əlbəttə, sən də mənimlə bərabər deyəcəksən ki, yox.

İndi, baxın, Bibiheybət mövqufat və nəzratı barəsində yazılan cavaba. Hələ qoy biz bunu qabaqca deyək ki, bu barədə biz «Günəş» qəzetinin yazdıqlarına şərik deyilik. Biz yəqin bilirik ki, bizim bugünkü rəisimiz pula, medala, nişana millətin və millətinin səlahın satan adamlardan deyil. Amma bilsə ki, filan iş millətin səlahıdır, ya deyil. Bu yazdıqlarımın türkcəsi budur ki, yuxarıda yazdığımız, millət ümuratın əlinə alan şəxsə kifayət etməz. O sifətlərin üstünə gərək «bilik və bacaracaq» da artırasan ki, millət rəyasətinə yaraya və bu zəmanəyə yarayan «bilik» və «bacaracaq» da olar darülfünun qurtarmış adamda ki, yuxarıda yazılan sifətlərlə bunun zəmanəyə yarayan bilik və bacarığı cəm ola, o adam da ola bizə çoban. İndi belə adam vardır, ya yoxdur, sözümüz orda deyil, biz ancaq bunu deyirik ki, vaqeən nəzir və niyaz hərraci-ümumilə satılmaz, lakin vəqf əmlak olsa, onu torq ilə vermək yaxşıdır. Amma elə ola ki, hökumət dırnağı ilişib hökumət çənginə düşməyə. Belə işlərə də elə bacaracaqlı və bilikli adam istəyir ki, nəzir və niyazı «həm» hərraca qoymaya, «həm» elə edə ki, arada «lotular» yeməyə və habelə əmlakı torqla verə. Amma hökumət əlinə düşməyə.

*Comərd*

## ŞER

Eyləmə qəm, ay başıboş bambılı,
Dünbəyi çal, düşgilə meydana sən.
Mütrübə, cindara, meyə səp pulu,
Sərf eləmə başqa bir ehsana sən.

---

Gündə həna bağlagilən yalına,
Açma gözün, baxma bir az halına,
Cəlb elə ənzari yoğun şalına,
Eylə səfər ildə Xorasanə sən.

---

Tazəbətazə elə siğə, nikah,
Bilgilən icrayi-təlaqi mübah.
Feyz qazan kəndinə şamü səbah,
Fövt eləmə ömrünü əfsanə sən.

---

Səy eləyib başına topla mürid,
Mədrəsəni, məktəbi et napədid.
Qoyma açılsın bir üsuli-cədid,
Görmə rəva elmi müsəlmanə sən.

---

Başını qırxdırgilən, həp pak elə,
Diqqət elə, qoymagilən tük gələ.
Salma bu dünyadə özün əngələ,
Dik gözünü cənnəti-rizvanə sən.

---

Qız götürüb qaçmağı bil çox hünər,
Dərdin ola, vermə təbibə xəbər.
İncimə üz versə qəzavü qədər,
Eylə fəda canını canənə sən.

---

Qoyma əyalın, çocuğun zad qana,
Qat otağa, bağla dilin, yıx yana.
Dərs yaraşmaz qıza, ya oğlana,
Qeyrət elə nəfi-cibişdanə sən.

---

Ölsə ölün quyla əmanət onu,
Qoyma yubanmaqlığa, əlbət, onu.
Torbaya tök, çat ata xəlvət onu,
Düş çaparaq bərrü-biyabanə sən.

---

Çox da qəzetlər səni təhqir edir,
Əksini jurnalda da təsvir edir,
Eybini, nöqsanını təhrir edir,
Vermə qulaq hərzəvü hədyanə sən,
Dünbəyi çal, düşgilə meydanə sən.

*Cüvəllağı*

## PROTEST

Doktor Bəhrəm bəy Axundov Bakı məscidində leksiya oxuduğundan Qafqazın hər nöqtəsində mollalar ilə mömin kablayılar bu işdən artıq dərəcədə qəzəblənib, hər yerdə təcili məclislər təşkil edib, qərar qoyublar ki, Bəhrəm bəy Axundovun bu hərəkətinə protest eləsinlər. Çünki Allah evi, məscid yaranıbdır bir ağlamaqdan ötrü, bir də ..... pul fəqərəsi var, onu demirəm. İndi neçə gündür ki, hər tərəfdən protest teleqrafları gəlməkdədir.

---

## ORENBURQ XƏBƏRLƏRİ

İdareyi-ruhaniyyəni, məktəb və mədrəsələri təftiş etmək üçün Peterburqdan gəlmiş məmurların, Ufadan Orenburqa təşrif gətirəcək xəbərləri eşidilən kimi, Orenburq və Qarğalı mollaları bütün-bütünə özlərini itirdilər. «Üsuli-cədidə haram» deyə bağıran mollalar da Platonikov əfəndinin imtahanından qorxub coğrafiya, hesab və tarixdən dərs xəbər almayacağına «Kamarinski» oynamağa, «rəqs etməyə» başladılar. Qurban bayramı günü məclisdən məclisə getmək və yağlı qurban əti yemək də yadlarından çıxdı. Hətta ən əziz bildikləri qurban dəriləri də gözlərinə görünmürdü.

---

Mərhum Mahmud bəyin vəsiyyət etdiyi on min manat Həcc pulunu əlinə keçirib Məkkəyə getmək niyyəti ilə Feyzi xan əfəndi mühərrirliyini buraxmışdı. Soradan haman pul biçarəyə nəsib olmadığından genə mühərrirliyi qəbul elədi. Sabiq mühərriri-məsul Xan İslamov istorojluğa təyin olundu.

---

İsmayılov adında birisi Orenburq məktəblərinin nəfinə bu günlərdə bir «sünnət toyu» tərtib etməyə hazırlaşır. Allah müvafiq buyursun!

---

## TELEQRAF XƏBƏRLƏRİ

Səmərqənd – Buranın dərvişləri yığışıb qapanmış «Tərbiyət» məktəbinin üzvlərinə ərizə verib təvəqqə etmişlər ki, məktəb hələlikdə boş qalınca bunlara izn versinlər ki, gecələr yığışıb səhər bazarda oxuduqları qəsidələri məşq eləyib əzbərləsinlər.

---

Ürgənc – «Molla Nəsrəddin» jurnalını müftə oxuyanlar gündən-günə artmaqdadır.

---

Bakı – Hacı Əbülhəsən içərişəhərlilərin acığına bir tuğ qayıtdırıb doqquz manata, özü də nəzir eləyibdir ki, tuğu özü gəzdirsin.

---

Şuşa – Bu gün üç gündür ki, çarxçı dükanlarında basa-basdır. Elə görürsən hər kəsin əlinə bir paslı xançal düşür, birbaşa yüyürür çarxçı dükanına. Söz yox, bu xançallar ilə başların yaracaqlar.

---

Vladiqafqaz – Hacı Molla İsmayıl küçədə divar dibində oturub günün istisində qızışırdı. Əz qəza dəli olmuş bir camış axundun üstünə hücum edib buynuzunun üstünə alıb çaldı yerə. Qabırğalarının hamısı batıb. Dirilməyinə ümid yoxdur. Şəhər böyük həyəcandadır.

---

## HACILARIN NƏZƏRİ-DİQQƏTİNƏ

Bu il vəfat etmiş Mahmud bəyin vəsiyyətnaməsində mərhumun əvəzindən bir nəfərə Məkkəyə getmək üçün on min manat vermək təyin olunmuşdu. Ancaq bu il bir nəfər imanlı və müqəddəs adam tapılmadığına görə gələn ilə qaldı. İndidən yazıb məlum eləyirik ki: hər kəs özü arzu eləsə və ya pak və şəriətmədar adam yeri bilsə, Orenburqda mərhumun varislərinə müraciət eləsin.

## NƏZM

Ay vaizi-möhtac, gəlib cisminə bir can,
Aç ağzını, yum gözlərini, mezdə fisincan.
Basmarra, qoçaq, qatleti, dolmanı doyuncan,
Balı, kərəni təklif elə sən nücəbayə,
Pendir qırığın tollagilən ac füqərayə.

---

Dövlətlilərə söhbəti aç cudü səxadən,
Kəs başlarını mümkün əgər olsa qafadən.
Bir kəlmə də söz söyləmə üryan füqəradən,
Cənnət bağını «kupçi» ilə sat hüməqayə,
Təkfir elə, təlin topunu at ürəfayə.

---

«Əhyadı» deyib qoymagilən xalq dükan açsın,
Qorxuz buları, təkfir elə məscidə qaçsın,
Qoyma qəzet alsın, oxusun, bir işə baxsın,
Çat baş-başa, anqırt buları, başla duayə,
«Amin» deyərək rəhmət oxu sən ümərayə.

Alim deyilən kəsdə gərəkdir əməl olsun,
Öz verdiyi fitvasına kəndisi inansın.
Yoxsa özü açsın dükanın, xalqa qapatsın,
Aldat bu yazıq xəlqi düçar eylə bəlayə,
Beşlikləri, üçlükləri bihəddü nəhayə
Yığ, yığ cibinə, eylə təməllüq bələhayə.*

*Xortdan bəy*

---

## QAFQAZ XƏBƏRLƏRİ

Naxçıvan – Birja bağlandı. Bu gün dabbaqlar öz rəisləri ilə birjanın qabağında nümayişlər etdilər. Əhali birjanın axırıncı qərardadını biqanunədd edərək, baykot elan edirlər. Zira Tehrandan Nəcmüddövlənin təzə təqvimi gəlib oxunmamış qurban dərilərinə birjada qiymət kəsmək dabbaqların qülubunu bərk təşvişə salmışdır. Polisə ciddiyyətlə çalışmaqdadır.

---

Əylis – Buranın ruhaniləri Molla Tahir və Molla Nurməhəmməd bu gün barışdılar. Əhali bu barışmanın müqabilində dörd klaslı bir məktəb açıb barışanların isimlərinə adlandıracaqlar. Müəllim axtarmaq üçün qəzetlərə elan verilmişdir. Bu şərt ilə ki, haman müəllim

---

*Əhlül cənnət əksərə-hum bələha.

Əylis kəndinin qabaqkı üsuli-qədim müəllimi ilə siğə qardaş olsun. Çünki Əylis hökumətinin Vreqret müahidəsində köhnə müəllimin hüququna toxunmamaq əvvəlinci şərtdir.

---

Nuxa – Orta məhəllədə məktəblər adına üç yüz dəri toplandı. Ancaq mollalar ilə müəllimlər arasında bərk iğtişaş var.

Qıraq məhlədə bir molla at ilə dəri yığan vaxt at yıxılıb molla qalıb altında, ağır surətdə əzilibdir.

Dağ dibi və Dağ dərəsi məhəllələrində dəri yığan vaxt iki molla boğuşubdur. Məhəlli-hadisəyə bir polk qaradovoy gəlibdir.

---

Naxçıvan – Təyyar cəmiyyətinin ayrapalanı xarab olmağa cəhət, Naxçıvan ilə Şahtaxtı arasında vaqe olacaq toy bir neçə gün təxirə düşmüşdür.

---

## İRAN İŞLƏRİ

Mərənd – On altı dərvişdən ibarət bir cəmiyyət Şüca Nizam otaqları qarşısında mitinq edərək, osmanlıların sərhəddə təcavüz etmələrinə protest etdilər.

---

Maran (Avstriyadadır) – Məhəmmədəli şahın əşyaları dəmir yol mövqufunda jandarm tərəfindən axtarıldıqda altı il bundan müqəddəm oğurlanmış Molla Şükürün falaqqası yükdən çıxmışdır.

---

## QAMÇI

Ay müqəddəs, musiqi tək elmi təkzib eyləmə!
Qaçma ondan, şər adıyla şəri təyib eyləmə!
Kim haram etmiş qinanı sahibi-ədyandən?
Sahibi-dinə toxunma, dini təxrib eyləmə!

---

## POÇT QUTUSU

Ağdaşdan «Səğir» imzalı yazana: Əfəndim, özünüzə bir qəyyum tutub adınızı idarəyə məlum eləməyənə kimi yazdığınıza inana bilmərik.

---

Qroznıda «Dördgözlü»yə: Heç əl-ayağa düşmə. Yazdıq, Naxçıvandan sizin ürəyiniz istəyən adamlardan bir vaqon gəlsin.

---

Nuxada «Haramzada»ya: Qarasaqqal əfəndiyə yazdıq ki, «Şik» restoranında dəxi bundan sora qumar üstə and içməsin.

---

Bakıda «Məmdəli Mirzə» barəsində yazana: Əfəndim, səbr elə, görək bəlkə «rəqqas xanım» rəhmə gəlib yazıq Məmdəlinin ürəyini sıxmayacaqdır. Hələ dua yazdırmaq və cindar yanına getmək məsləhət deyil.

---

Ordubadda «Xəbərçi»yə: Bazar çörəyi həmişə gərək şor və acı olsun, çünki camaat kasıbdır, girvənkəsi üç abbasıya istiot (fil-fil) alıb bişmişə tökə bilməzlər.

---

Aşqabadda «Qoyma qaçdı» imzası ilə yazana: Xörəyi çox yağlı yemə, kağız yazanda adın yadından çıxar.

---

Culfada «Filankəs»ə: Əfəndim, qərq olmaqdan xilas olan fəhlələrin Culfa dəmir yolu ilə gəlməklərinə mane olduq. Yoxsa onları da Yacılı müsəlman qardaşlar Aras çayına qərq edərlər.

---

Aşqabadda «Qulaqca»ya: Məşhur Kor Məhəmmədəli əmiyə yazdıq ki, gedib sənin acığına səkkiz yaşında bir arvad da alsın.

---

Əylisdə «Müsafir»ə: Danışmağa gəlməz; müsəlman gərək başıqapazlı olsun. Ümidini Allaha bağla.

---

Tiflisdə «Molla Həsrət» cənablarına: Əfəndim, sizi və ya qeyrisini hər kəs təkfir etsə, biz onun ziddinəyik. Ancaq məqaləniz hələ qalsın.

*Müvəqqəti müdir: Məhəmmədəli Sidqizadə*

## ELANLAR

Прибытие на Кавказъ будущихъ предварителей религиозныхъ армий Шахсей-вахсей.



– Nə var, nə olub? Nədən qorxub qaçmaq istəyirsiniz?

– A başuva dönüm, görmürsən iranlılar bizə elani-hərb etməmiş baydağ götürüb sərhəddə hücum edirlər?!

– Xa, xa, xa... Adə, bu uruslar nə axmaq olarmış. Balam, onlar davaya gəlmirlər, onlar molla, seyid, mərsiyəxan, cindar, dərviş və tuğ gəzdirəndirlər. Məhərrəm yaxınlaşmağa görə Qafqaza keçirlər.

ملانصرالدين

№41 Qiyməti 12 qəpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 k. № 41




Литог. С.Быхова

Nasirülmülk: – Paho! Bəs mən harda oturum?



## TƏZƏ İL ÜÇÜN ABUNƏ QİYMƏTİ

Qafqazda və Rusiyada
12 aylığı – 5 manat.
«———» 6 aylığı – 3 manat.
«———» 3 aylığı – 1 manat 60 qəpik.
Əcnəbi məmləkətlərdə:
12 aylığı – 6 manat.
«———» 6 aylığı – 4 manat.
Tək nüsxəsi idarəmizdə 10 qəpik, özgə şəhərlərdə 12 qəpik.

**İDARƏ VƏ KANTOR:**

Tiflis, Davıdov küçəsi, nömrə 24.
**Тифлисъ, Давыдовская № 24,**
Редакция журнала «Молла Насреддинъ».
Teleqram üçün adres: Tiflis, «Molla Nəsrəddin»ə.
**Тифлисъ, «Молла Насреддинъ».**
Elan qiyməti: Qabaq səhifdə petit ilə bir sətri 10 qəpik, dal səhifədə 7 qəpik. Adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

## ƏDƏBİYYAT

Gəldi genə Rəhim xan İrana, barəkallah!
Çıxdı əcəb igidtək meydana, barəkallah!

—

Çün gördü başpozuqluq olmuş bu qövmə pişə,
Etmiş camaat adət qan tökməyə həmişə.
İştə bu zalım istər vursun dübarə tişə,
Aləm bütün boyansın al qana, barəkallah!

—

Bir-bir çü müstəbidlər İrana olmuş azim,
Rusiyyədə dübarə qalmaq daha nə lazim?
Fikri budur ki, şahə olsun genə mülazim,
Etmiş qəsəm şu əhdü peymanə, barəkallah!

—

Gördü ki, parlamanda var başqa ciddü qeyrət,
Axırda verdilər çün Eyniddövləyə vəzarət?
Gəldi bu da təpilsin qoysun binayi-qarət,
Yar olsun ibn Ümmülxaqanə, barəkallah!

—

Bunlar ki, getdi; dəydi çün bir-birinə İran,
Oldu bütün vilayət əhrar əlində viran.
Oldur ki, nail oldu dilxahına Rəhim xan,
Müjdə yetişdi Zilli-Soltana, barəkallah!

—

Söz yox, gərəkdi çatsın məqsudinə Sipehdar,
Olsun cəri qitalə yeksər güruhi-əşrar.
Ta bəlkə Məmdəlini cəlb eyləsinlər təkrar,
Gəlsin, özün yetirsin Tehrana, barəkallah!

—

Yefrem gərəkdir işdən çıxsın bütün kənara,
Təfviz olunsun işlər öz əhlinə dübarə.
Lazımdı mürtəcelər çatsınlar ixtiyara,
Gəlsinlər şəhsevənlər cövlana, barəkallah!

—

Caiz deyil ki, olsun Təbrizdə əmnü rahət,
Labüddü Həştrudda qopsun gərək qiyamət.
Kürdlər Savucbulaqda yapsın gərək cinayət,
Dönsün həmişə cənnət niranə, barəkallah!

—

Müştaqdir camaat bəs kim, vücudi-şahə,
Tabedilər həmişə qəlbən cünudi-şahə.
İşdə yetibdi şimdi növbət vürudi-şahə,
Gəlsin, keçirtsin ömri-şahanə... barəkallah!

*Cüvəllağı bəy*

## DEYİRLƏR

*(Əli bəy Hüseynzadə İstanbula gedir.)*

Bir gün ağıldan kasıb bir kişi məscidə təşrif aparır, görür molla vəz edib deyir ki, mötəbər hədisdə yetişib «Əz zəhəb yəcüz zəhəb», yəni qızıl qızılı çəkər.

Biçarə kişi çalışıb, çapalayıb bir qızıl ələ gətirir, sora girir Təbrizin «Dəllahəzən» bazarına, gəlir uzaqdan durur bir sərrafın dükanının qabağında. Əlindəki qızılı tutub, hey gözətlər ki, sərrafın qızıllarını indi çəkəcək, bu saat çəkəcək. Axırda görür ki, çəkmədi, kişi bir burnunu çəkir, bir çiyinlərini çəkir. Bir az da yaxına gəlir, görür çəkmədi. Təbrizin bir dəllalı məsələni başa düşüb deyir ki, qardaş, heç ürəyini sıxma, eşitdiyin doğrudur. Lakin bu bir qaydadır ki, həmişə az çoxa tabedir. Gətir o qızılını da at bu qızılların üstünə, get işinə.

İndi Əli bəy də İstanbulun elmini, mərifətini Bakıya çəkmək istədi, lakin məsələ baş-ayaq çıxdı. Genə İstanbul onu zorlayıb özünə çəkdi.

Bəli, keçək mətləbə.

Dünən Tiflis vağzalında veyil-veyil dolanırdım, birdən gözüm sataşdı Əli bəy cənablarına. Görüşəndən sora soruşdum ki: – Xeyir ola, bəy əfəndi, siz hara,

bura hara?

O – İstanbula gedirəm, əfəndi.

Mən – Səbəb?

O – Doğrusu məhərrəm yaxınlaşdığı münasibətilə gedirəm ki, Bakıya bir sürü rövzəpəz göndərim.

Mən – Sən Allah, zarafat eləmə, doğru söylə, əfəndim.

O – Doğrusu Bakıda işim tutmadı.

Mən – Canım, sən yaxşı şəkil çəkirsən, oracıqda Çəmbərəkənd ilə Quba meydanının şiələrinin şəklini çəksəydin, həmi də çox pul qazanardın, həmi də adın çıxardı.

O – Əfəndim, kərgədən şəkli çəkmək istəsəm Afrika çöllərində lap yaxşısı var, ayı şəkli çəkmək istəsəm, Rusiyanın şimal tərəfində daha gözəl tiplər tapılar.

Mən – Əzizim, ədəbiyyat yazıb Bakı darül-maarifini müstəfeyiz edəydiniz.

O – A kişi, bu nə sözdür deyirsən? İndi Bakıda yetişmiş, özü də xalis bakılı neçə milyon ədib istəsən hazırdır!..

Mən – Bax, mən ölüm deyəndə su durar. Mən ölüm, düzünü de görüm, Bakını niyə tərk etdin?

O – İndi ki, mən ölüm dedin, qoy deyim: Əzizim, sözün açığı budur ki, mən bir qəlbi yumşaq adamam, Bakıda hamı bilir ki, bən də bir cümə axşamı Bibiheybət ziyarətindən qalmaram. İndi evi yıxılmış şeyxülislam onu da əlimizdən almaq istəyir. Genə Allah ömür versin Bakı qəzetçilərinə, əgər o cənablar olmasaydı, şəriət, din lap əldən gedərdi. Bu müqəddəs zatlar Bibiheybət işində çox çalışırlar, Allah onları bizə və cümlə şiələrə çox görməsin... Və şeyxülislama da bir az insaf versin... Amin, ya rəbbül-aləmin.

*«Molla Nəsrəddin»in vağzal müxbiri*

## TEYMURXANŞURADAN

Məhərrəmlik münasibəti ilə neçə gün bundan irəli şəhərimizə bir nəfər mərsiyəxan varid olub, möhtərəm bir şəxsin evində mənzil qərar buyurmuşdular. Keçən gecə mərhum olmuş bir hacının təziyəsində mərsiyəxan cənabları nümunə üçün bir mərsiyə oxudu. Mərsiyəxanın oxumağı məclisdə olan qulaqlıların ağlını aparıb valeh etmişdir.

Rəislərimizdən neçə nəfəri axundu bu il məhərrəmlik burada saxlamaq istədilərsə də, çifayda ki, Petrovski camaatı iki ay bundan qabaq axunda beh verib vədəsini almışlar. Hərçənd Teymurxanşurada köhnə mərsiyəxanımız vardır, ancaq bu cənabın əqidəsi bu axır vaxtlarda lap xarab olub, bir para təzə işlərə qarışdığından rəislərin hökmilə camaatın nəzərindən düşüb. Daha bundan sora buna mərsiyə oxutmaq haram buyurulubdur. Teymurxanşuranın bu il mərsiyəxansız qalmağı camaatı təşvişə salmışdır. Dünən təcili olaraq bu barədə məşvərət üçün məclis təşkil olunmuşdur. Təfsilini yazaram.

*İmza: Dağıstan bülbülü*

## BU DA, YAHU, KEÇƏR

Qonşuların elmə həvəskar ola,
Tibb oxuya, fənnə xəbərdar ola,
Leyk müsürman gedə cindar ola,
Dinmə, danışma, bu da, yahu, keçər.

Rus minə omnibusu, seyr edə,
Nemsə minə dirjabili, teyr edə,
Molla Cəfər həmzadı təsxir edə,
Dinmə, danışma, bu da, yahu, keçər.

Xivə xanı saxlıya altmış bala,
Simbədən, zöhrəcəbin, göz ala,
Məsti-meyü şəhvət olub dal qala,
Dinmə, danışma, bu da, yahu, keçər.

Əbdüləhəd xan sata milləti,
Bada verə namus ilə qeyrəti.
Puç eləyə Rusiyada sərvəti,
Dinmə, danışma, bu da, yahu, keçər.

Kərpicsatan millətə salar ola,
Qatırsatan ləşkərə sərdar ola.
Sırf avam şəxs Sipehdar ola,
Dinmə, danışma, bu da, yahu, keçər.

Layihə təqdim edə İngiltərə,
Hökm verə zabitə, həm əsgərə,
Daxil edə ləngər ilə bəndərə,
Dinmə, danışma, bu da, yahu, keçər.

Hacı Məmiş ayda bir arvad ala,
Keyf eləyə, işrət edə, dad ala.
Xansənəmi boşluya, Pərzad ala,
Dinmə, danışma, bu da, yahu, keçər.

Bəylərimiz qastin ara keyf edə,
Dəstə ilən fahişəni zeyf edə,
Vermiyə pul millət üçün, heyf edə,
Dinmə, danışma, bu da, yahu, keçər.

İnteligentlər gəzələr naz ilən,
Gülşən ara dilbəri-tənnaz ilən,
Evdə qala Gülpəri Çimnaz ilən,
Dinmə, danışma, bu da, yahu, keçər.

*Xortdan bəy*

## MƏHƏRRƏM XƏBƏRLƏRİ

Tiflis – Məhərrəmlik başlandığından «Tiflis müsəlman dram cəmiyyətləri» teatro sezonunu bağlayıb, qırx gün məhərrəmi kəsalət ilə keçirtmək üçün, Şeytanbazarın dişləmə çaylarını içməyi podrat götürdülər.

Gəncə – Vağzalda fahişəxana saxlayan Məşədi ... məhərrəm yetişdiyinə görə, fahişəxananı müvəqqəti olaraq bağladı. Zərər hədsizdir.

Naxçıvan – Dünən yük qatarı ilə İrandan Culfa təriqi ilə bir vaqon sinəzən kitabları yetişdi. Kitabsatanlar başlarının keçəlini qaşımağa macal tapmırlar.

Ordubad – Məhərrəm yaxınlaşdığından buranın qırmızısaqqalları mübarək saqqallarını hənalayırlar. Hamamlarda yer yoxdur. Dəlləklər nahar etməyə vaxt tapmırlar. Hənanın qiyməti artıbdır. Şəhər bərk şuluqdur.

Şamaxı – Nalojni göndərilən bir vaqon şaxsey ağacları təhvil alındı. Neçə gündür ki, paylayırlar.




Tehranda Mustafa nam evində toy məclisində sazanda gətirib çaldırdığı üçün, Ağa Nurəddin müctəhidin xidmətində Hacı Molla Əbutalıb müctəhidin ona həddi-şəri vurması.




Siz Allah, bir baxın, görün, bu Molla Nəsrəddin xalqı necə nahaq biabru eləyir. Hərgah buna indilikdə bir əlac...




Zalım oğlu nə yerində çəkib! Ax, qələminə qurban olum!.. (Təklikdə.)

---

Bakı – İçərişəhərlilər bayırşəhərlilərin acığına bir Qasim otağı qayıtdırırlar «konka» boyda. Özü də beş minarəli olacaq. Orta minarəsi də qeybdən fırlanacaq.

---

İrəvan – Şəhər müsəlmanları on gün məhərrəmi hər gün özünə məxsus (sveji) təzə və gözəl sinəzən yazmaq üçün bir şair axtarırlar. Qafqazın hər nöqtəsinə və Təbrizə teleqraf vurublar. Hələ bir cavab yoxdur. Dəstə rəisləri bərk təşvişdədirlər.

---

Şuşa – Ələmdarların canlarını spirt ilə ovurlar ki, qıfılbənd edəndə və üstünə dörd put dəmir yükləyəndə təpik atmasınlar.

---

Tiflis – Toylar sovuşdu. Məhərrəmlik başldandı. Müsəlmanlar qət elədilər ki, gələn ildən toylarda pul yığılmasın. Bu il Tiflis təziyədarları Əncümən üzvləri kimi artıq kəsalət ilə tərpəşirlər. Allah özü kömək olsun.

---

Fazili-şəhir və vaizi-binəzir Kəblə Ağabala əmi şiə məscidində orucluqda elədiyi nafe moizələrin mabədini vəz etməyə başladı.

---

## ÜRƏFAYƏ

Nə qədər tən edəsiz, məsləkimizdə durarız,
Cəm edib başımıza cümlə əvamı soyarız,
Yetimə cəbr eləyib, xümsü zəkat aldırarız,
Gündə bir cildə düşüb min cürə rənglər boyarız,
Müxtəsər, eyş edib, hər gecə rahət yatarız.

---

Sanmayın kim, bu qədər qəflət edib yuxlamışıq,
Yaxşıca hiylə qurub, çoxlarını tovlamışıq,
Xəlqi ram etmək üçün güclü mürid saxlamışıq,
Lazım olsa, nə yalan, dini də əldən qoyarız,
Müxtəsər, eyş edib, hər gecə rahət yatarız.

---

Gecə-gündüz çalışıb milləti iğfal edəriz,
Söhbəti-məzhəb ilə fikrini işğal edəriz,
Elmdən mən edib, yeksəri izlal edəriz.
Gah da fitnə salıb, bir-birinə qırdırarız,
Müxtəsər, eyş edib, hər gecə rahət yatarız.

---

Sizlər ilə olamaz hiç bizim ülfətimiz,
Sizi gördükcə təzaid ediyor nifrətimiz,
Bizə lazım cühəla kim, ucala izzətimiz,
Alıban var-yoxunu, hali-süala salarız,
Müxtəsər, eyş edib, hər gecə rahət yatarız.

*Füzul*

---

## NUXA HADİSATI

Əzizim Molla əmi! Qurban olum sənin qurşağına, heç bilirsənmi ki, Nuxada nələr var? Salam-duadan sora qulluğunuza ərz olsun ki, belə çox qəribə şeylər var ki, bilmirəm haradan başlayım. Sənin canın üçün zalım oğlunun yeri Ordubad nədi, İrəvan nədi, Tehran nədi ki, lap Pariji, Londonu da ötübdür. A kişi, bir fırıltı var ki, mollaların da başına belə iş gəlməyib. Bilmirsən ki, hansı məclisə gedəsən, hansı dəvəti qəbul edəsən, hansı danışana qulağını uzadasan. Bu saat şəhər ağzına kimi «millət» sözü ilə, «maarif» söhbəti ilə doludur. Elə qəribə adlar qoyublar ki, indiyə kimi eşitməmişəm. Nə bilim, nəşri-maarif, cəmiyyəti-xeyriyyə, nəşri-cəhalət, cəmiyyəti-ziddiyyət, şirkəti-əmniyyət, şirkəti-xövfiyyət, məktəbxana, mərsiyəxana, qiraətxana, teatr, biyatr. A kişi, hansı birin deyim, saymaq ilən başa gəlməz ki. Cəmi Yevropada çıxan bijliklərin təqlidi bizim dağılmış şəhərimizdə vardır. Gündə yetmiş iki söz eşidilir, həştad cür məzhəbə sitayiş edirsən, axşam yatanda genə məzhəbsiz yatırsan. Söz öz aramızda qalsın, bir neçə adamlar var lap camaatın zəhləsini aparıblar. Elə birisi bizim axund: qız məktəbi açdı, oğlan məktəbləri açdı, yas yerində yeyib-içməyib xeyrat halvasını tərk etdirdi, baş yarmağı götürdü, təkyələri yığışdırıb camaatın başını bir məscidə bağlayıb, məktəblərə xərc etmək üçün camaatın pullarını sandıqlara doldurdu. Axır ki, olmazın işlər gördü. İndi də başlayıb ki, var-yoxunuzu gərək nəşri-maarif və cəmiyyəti-xeyriyyələr uğrunda xərcləyəsiniz.

Bundan başqa bir müəllim var ki, teatra, məktəbə pul yığmaqdan daha xalqı təngə gətirib. Hələ utanmaz-utanmaz dünən görürəm ki, aşağa bazarda bir kişini yaxalayıb ki, gərək cəmiyyəti-xeyriyyəyə üzv yazılasan. O axmaq da dedi: baş üstə!

Yaxşı ki, bunların yanında dünyagörmüş bir kablayı var idi, o axmağı başa salıb dedi ki: Ay başıdaşlı, cəmiyyəti-xeyriyyənin axırı bilirsən nə olacaq? Axırı belə qamitet deyirlər, qanfet deyirlər, nə deyirlər, o olacaq. Axmaq olub belə şeylərə pul vermə.

Doğrudan da, Molla əmi, heyf deyilmi köhnə adətlərimiz? Məsələn, dünən anam ilə kürsüdə oturmuşduq. Anam dedi ki, balam, sabah bir az pambıq al, yetimlərə mitildən-zaddan tikim. Bir azdan sora dedi ki: Qurban sənə, sabah çaharşənbədir. Qoy dursun biri gün alarsan. Dedim: sabah alsam nə olar? Dedi ki: çaharşənbə və şənbə günləri alınan şey mürdəşirə qismət olar.

A kişi, doğrudan, bu köhnə adamların qədrini bilmək lazımdır. Bunların sinəsində necə hikmətli sözlər var!.. Molla əmi, bunlar keçəndən sora bizim təzə qazidən gözüm su içmir.

*Dərdmənd*

---

## MƏSƏLƏ

Əhməd dul anasını verdi Həmidə, Həmidin dul anasını aldı Əhməd (yəni təzvic etdi). Hərəsindən bir oğlan oldu.

Sual olunur, bu uşaqlar bir-birinə qohum-əqrəba olduğuna görə bir-birini nə deyib çağırsınlar? Təvəqqe edirik ki, bu məsələni tezlik ilə həll edib idarəmizə göndərsinlər, çünki üsuli-cədid üzrə açılan məktəblərin birində müəllim cənabları şagirdlərə bu məsələni həll etmək üçün bir həftə vaxt vermişdir.

---

## TELEQRAF XƏBƏRLƏRİ

Həştərxan – «Bürhani-tərəqqi» qəzeti bu ildən başlamış gələn ilə kimi verdiyi cərimələrin hesabını saxlamaqdan ötrü idarənin məxaric dəftərindən əlavə olaraq bir «cərimə dəftəri» çap eləməyi sifariş verdi. Haman dəftəri saxlamağa təcrübəli bir buxqalter axtarılır.

---

Bakı – Bibiheybət ziyarətgahı bərk lərzədədir.

---

**«İntiharə sui-qəsd»**

Vyana – Neçə vaxtdan bəri təbdili-abü hava üçün Vyanaya gələn Məhəmmədəli Mirzə orada aşiq olduğu «rəqqas xanımdan» aldığı axırıncı məktubu oxuyub, özünü öldürmək istəmişsə, yanında olanlar mane olub onun köpünü yatırmışlar. İndi neçə gündür ki, biçarə yorğan-döşəkdə yatır. Vyana həkimləri mərizin dərdinə əlac aramaqdan ötrü cəm olublar. İrandan iki nəfər müqtədir cindar çağırmağı qət etdilər.

---

## ELAN

Hər kəs rus Culfasından İran Culfasına və ya İran Culfasından rus Culfasına keçmək istəyə, mehmanxanalara, qəhvəxanalara və düşəcək yerlərə bələd olmaya, İran gömrüyünün «fərraşbaşı»sı əlində əsa, qul kimi qabağa düşüb bələdçiliyi kəmali-məmnuniyyət ilə qəbul edir. Zəhmət haqqı hər kəsin öz iltifatına görədir.

Pul olmasa da bir «rumka» arağa da qənaət edir.

---

## QAFQAZ XƏBƏRLƏRİ

Vladiqafqaz – Hacı Molla İsmayıl 18 yaşında olan öz oğlunun adına bir tərəkəmənin on dörd yaşında qızın alıb, evinə gətirib özünə övrət elədi. Çünki Hacı axundun övrəti çox qoca olduğundan Hacını cavanlaşdırmaq imkanı qalmamışdı.

---

Vənənd – Qurban bayramında yığılan dərilər ianə komissiyası tərəfindən Əshabül-kəhf dəmir yolu nəfinə yığılır. Bu günlərdə yolun ikinci xətti başlanacaqdır.

---

Aza (Ordubad mahalındadır) – Kənddə toylar başa gəldi. Lakin hər tərəfdən gələn xanəndə dəstələri hökumətə müraciət edib, öz yol xərclərini toy sahibi Kərbəlayı Həsən kişidən tələb edirlər. Çünki Aza cavanları bütün sazandaları evə qoymayaraq ancaq on səkkiz sinnində Matosov ağanı qəbul elədiklərindən sair sazandalara macal olmadı. Çünki Matosov həm mütrüb, həm də oxuyandır.

## MƏHƏRRƏM TÖHFƏSİ

*Düşünənlərə:*

Mollaya verib pulunu olma mütəfaxir
Kim, həqq yoluna eyləmisən bir gözəl ehsan.

Bir vədi-behişt ilə belə etmə təğafül,
Mollaya məgər tapşırılıb rövzeyi-rizvan?

Həqqi arayan kəs füqərayə edər imdad,
Fəqr əhlini müztər görəməz sahibi-vicdan.

*Füzul*

***Müvəqqəti müdir: Məhəmmədəli Sidqizadə***



Balaları üçün Rusiyaya ruzi qazanmağa gələnlər.

Rotter

Atasız qalan balaları ovlamağa gedənlər.

10 məhərrəm 1328 **Beşimci il** 30 декабря 1910 г.

# ملانصرالدين

№42 Qiymәti 12 qәpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 к. № 42



Litoq. S.Bıxova

– Bu kimdir?
– Bu mənim mənkuhəmdir.
(Məbədisi həmin nömrədə.)




**TƏZƏ İL ÜÇÜN ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiyada: 12 aylığı – 5 manat.

«———» 6 aylığı – 3 manat.

«———» 3 aylığı – 1 manat 60 qəpik.

Əcnəbi məmləkətlərdə: 12 aylığı – 6 manat.

«———» 6 aylığı – 4 manat.

Tək nüsxəsi idarəmizdə 10 qəpik, özgə şəhərlərdə 12 qəpik.

**İdarə və kantor:**

Tiflis, Davıdov küçəsi, nömrə 24.

Тифлисъ, Давыдовская № 24,

Редакция журнала «Молла Насреддинъ».

Teleqram üçün adres: Tiflis «Molla Nəsrəddin»ə.

Тифлисъ, «Молла Насреддинъ».

Elan qiyməti: qabaq səhifdə petit ilə bir sətri 10 qəpik, dal səhifədə 7 qəpik. Adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

## ƏDƏBİYYAT

1910-cu ilə vida:

Doqquz yüz onuncu il də bitdi,
Doqquz yüz on birinci yetdi.

Bəxş etdi bu il cahaniyana
Min dürlü həvadisü fəsanə.

Boş qalmadı ərseyi-siyasət,
Üz verdi mühüm qaç hüquqat.

Əzcümlə düzəldi kari-İran,
Tək əllicə kənd olundu viran.

Bir dəfə nə iğtişaşü üsyan.
Oldu, nə qitalü qəsbü talan.

Qət eylədi ki, gələ parlaman
İrana dübarə Zilli-Soltan.

Avropaya getdi Mədəli şah,
Fikri nə isə, bilir bir Allah.

Bu ildə Tolstoyun vəfatı
Məyus buraxdı şeş cəhatı

Osmanlılar aldı nəqd pul qərz
Almanyadan, olmuşdu çün fərz.

Çox qan axıdıldı Portuğalda,
Axırda qovuldu lap «kral» da.

Bakıda bir özgə yerli tacir
Tab etmədi, boynu sındı axır.

Qırx-əllicə min manatı uddu,
Hulqumunu «pullu»nun qurutdu.

Həm Gəncədə qalmış idi bir az,
Sınsın beli vardı neçə bəzzaz.

Sel gəldi, Şəki dağıldı, batdı,
Məktəb sözü elm işiylə yatdı.

Namusa ədular əl uzatdı,
Yatmışları bilmə ki, oyatdı.

Yüz min oxumuş olundu təkfir,
Məşrutəçilər edildi təhqir.

Mollalar əzəlki tək dayandı,
Məcmuəçilər işi yubandı.

Əl qissə, bu il çox işlər oldu,
Yer yoxdu yazam, səhifə doldu.

Bu həftə qurub biz ictimai,
Köhnə ilə eylədik vidayi.

*Kefsiz*

---

## DEYİRLƏR

Deyirlər ki, Nasirülmülk aşuranı Venada eləyib, ərbəini İstanbulda keçirib, Novruz bayramını Tehranda olacaqdır.

---

İrana keçib Qara dağa dırmaşan Rəhimxan, axır ömrünü İranda istirahət ilə keçirtmək fikrindədir. Qeyri bir işə qarışmağa meyli yoxdur.

Bu il aşura günü Qubada Molla Hacı Baba, Aşqabadda Seyid Məhəmməd, Vladiqafqazda Molla İsmayıl, Naxçıvanda Mirəbdülhüseyn və Petrovskidə Molla Qivam Molla Nəsrəddinin acığına dəstəbaşı olub başlarını yaracaqlar.

---

Bu il məhərrəm gecələri məscidlərin havası çox təmiz və gözəl keçir, tüstü-filan yoxdur. Məscidin aşağısından baxan minbər üstə olanı aşkar görür. Çay içmək mövquf olub, əvəzinə plov veriləcəkdir.

---

Deyirlər ki, hələ bu il çox zadlar olacaqdır... Hə, yadıma düşdü, bir də bunu deyirlər ki, bu il Tiflis dram cəmiyyətlərinin, birisinin cavan rejissoru dəstə rəisi olub və birisinin də çinovnik suflyoru növhə deyir, hələ minbərin üstünə də ayağı çəkməli çıxır.

Qərəz, bizim də iltimasi-duamız var...

*Qulağçı*

---

**EŞİTMƏYƏNƏ**

Varını ver mollaya, qoy ləzzəti çəksin müdam,
Rahət olsun, eyş etsin hər zaman bir zövq ilə.

Neyləyir mülki-cahanı sən kimi başsız avam?
Adət etmiş zillətə, ömrü keçir hər tövr ilə.

*Füzul*

---

**ORENBURQ XƏBƏRLƏRİ**

Bura müsəlmanları dumada müsəlman fraksiyasında danışmaq və bir para köməklikdə bulunmaq üçün, sabiq Duma əzası Xeyrullah Molla Osmanov cənablarını Peterburqa göndərmişlərdi. Bu cənab belə xəbər gətirdi ki, guya bəzi müsəlman müəllimləri «məktəblərdə dərslər ana dilində, yəni tatar dilində oxudulmasın, biz tatarca bilmiriz» – deyə fraksiyaya müraciət edib protesto etdilər. Halbuki «Vəqt» qəzetinin 701-ci nömrəsində fraksiya rəisi – Təvəkkülov cənabları bu xəbəri təkzib edir. Deməl ki, Xeyrullah Molla tatarcanı anlamamış. Afərin belə deputatlara!

---

Noyabrın 30-da vaqe olan «Şərq gecəsi»ndə «Nizamlı mədrəsə» nam komediya oynanılacağını bilən «Mədrəseyi-Hüseyniyyə» müəllimləri şəhərin hər tərəfinə dağılıb, dövlətlilərin ətəklərini öpüb, yalvarıb-yaxarıb, teatroya tamaşaya getməmələrini rica etmişlər. Səbəbi də mədrəsənin bir para örtülü işləri və bəzi hallarının meydana çıxması imiş.

---

Müfəttiş Platonikov cənabları təftişini tamam etdi. Köhnə üsullu mədrəsələrdə otuz il təhsil etmiş şagirdlər coğrafiya imtahanında, yerin öküz üstündə, öküzün balıq üstündə və balığın su üstündə qərar tutduğunu gözəl surətdə bəyan etdiklərindən müfəttiş əfəndinin afərininə nail oldular. Müfəttiş cənablarının ziyarətindən «Vəqt» artıq məmnun olmuşsa da, mollalar o qədər məmnun deyillər. Çünki Qurban bayramında olan məclislərin olar üçün heç kefi və qurban ətlərinin də ləzzəti olmadı. «Mədrəseyi-Hüseyniyyə» mütəvəllilərinə müfəttiş ağa deyibdir ki, mədrəsənin bu qədər böyük vəqflərinin kontrolu olsa, zərər verməz. Əhməd bəyin istipendiyaları münasib görülən füqəra tələbələrə verilir. Qarğalıya müfəttiş getməyəcəyin eşidən ora mollaları şadlıqlarından qurban kəsib toy-bayram eləmişlər.

---

**BEHİŞT XƏBƏRLƏRİ**

Behiştdən alınan teleqraflardan məlum olur ki, məhərrəmin əvvəlindən təcili olaraq behiştin xiyabanlarını, hovuzlarını və qəsrlərini təmizləyib, huri-qılmanlara ziynət verib, dəstələrdə zatülcənb olan və baş yaranda şəhid olan şiələrin yollarını gözləyirlər.

---

**ŞƏKLƏ BAXIN**

– Bu kimdir?

– Bu mənim mənkuhəmdir.

– Bay, a filankəs, mən səni belə bilmirdim. Sən də 12 yaşında qızı özünə övrət eləmisən?

– Yox, əzizim, səhv etmə, hələ toy etməmişəm, ancaq nikah etmişəm... Çünki mən bilirdim ki, gərək evlənəm, özümün də çox meylim var idi ki, öz vətənimdən evlənəm, amma tərbiyəsiz qız ilə də keçinə bilməzdim, oxumuş və tərbiyəli qız da vətənimizdə tapılmır. Əlacsız bu on iki yaşında qızı kəbin eləyib gətirdim ki, öz ticarətim də ki, Rusiyadadır, bunu da öz yanımda beş-altı il oxutdurub tərbiyə etdirim, sora da toy edim. Nə edək, bəradər? Bizim işlərimiz bircə Allaha qalıb.

---

**YAXŞI OLARDI**

Doğrudan çox yaxşı olardı ki, Bakıda olan «Səda» qəzetəsi çap elədikləri sinəzənləri ayrı bir vərəqədə çap edə idi. Çünki qəzeti məscidə aparıb üzündən sinəzən oxumaq çox böyük günahdır.

---

**Teleqraf xəbərləri**

Petrovski – Elm və mədəniyyət tərəqqisi günbəgün artmaqdadır, hamı işlərimiz öz qaydasınca gedir. Məhərrəm düşməyinə görə mərsiyəxanların bazarı rəvacdır.

---

Bakı – Qafqazdan İrana gedən müsafirlərdən sərhədlərdə hər biletə beş manat yarım alınmağı Bakı konsulu mövquf elədi. Ancaq qanuna görə, altmış qəpik İran dövləti nəfinə qol pulu alınır. Və qırx qəpik də alıb rus dövlətinə verir. İrana gedən müsafirlərin gözləri aydın.

---



Mərsiyəxan: – Tez-tez gəlin, qardaşlar, gecə keçir. Dadaşım tərlidir. (Naxçıvanda tasua gecəsi.)



Baron Artun.



Artum Yeqoroviç.



Artun kirvə.



Hacı Həsən.



Kərbəlayi Həsən.



Məşədi Həsən.

Rotter

---

Təbriz – Müinül-islam vəz edən zaman məscidin qapısına iki nəfər kazak qarovul qoyur ki, «bicləri» içəri qoymasınlar. Çünki gəlib moizə əsnasında şuluq eləyib, axundu «salavata» basırlar.

---

Naxçıvan – Məhərrəm gecələri məscidlərdə camaatın kəsrətindən, şiələrin qəlbində olan təziyədarlıq məhəbbətinin hərarətindən (paprusları demirəm) hava o qədər istidir ki, hərgah qəhvə fincanlarının cınqıltısı, xırdaca südəmər uşaqların cığıltısı və salavat gurultusu olmasa, adamı yuxu basıb, deyilən moizələrdən və oxunan mərsiyələrdən müstəfiz ola bilməz.

---

Tiflisdə Şeytanbazar hamamlarında qulluq edən dəlləklər bəzi səbəblərə görə öz qulluqlarından istefa verdiklərindən, bu saat haman hamamlarda 200-ə qədər vakansiya açıqdır. Yazıb hamı müsəlman qardaşlara məlum edirik ki, hər kəs istəyirsə indidən ərizəsini pişnəhad etməlidir. Bu şərt ilə ki, ərizənin içində qırx manat da pul olsun. Xahiş edənlər yanvarın onuna kimi təşrif gətirə bilərlər. Pulsuz ərizələr qəbul olmur.

*Adres: Tiflis, Şeytanbazar, «hamam xozeyinləri».*

---

## HİCRANA DÖZMƏYƏN ƏMİLƏR

Məhərrəm düşdüyündən Şeytanbazar qırmızısaqqallarının başı belə qarışıb ki, biçarələrin bir saat vaxtları yoxdur ki, bulvara çıxıb göyçək uşaqları ziyarət etsinlər. Axırda firqətə dözə bilmədiklərindən bir növ ilə onları Şeytanbazara cəlb edib, təcili onlar ilə görüşüb, genə öz təziyədarlıqlarının dalınca qaçırlar. Allah belə mömin və dindar qardaşları Şeytanbazar müsəlmanlarına çox görməsin.

*Kəblə Səftər*

---

## QIZIL ÖKÜZ QOCALIB

Üstündə yaşadığımız yeri buynuzunun üstündə saxlayan qızıl öküz qocaldığından o qədər öskürür ki, gündə dünyanın bir tərəfində zəlzələ olur. Bu zəlzələlərin qabağını almaqdan ötrü lazımdır ki, mömin və müqəddəs şəxslər əllərini Allah dərgahına qovzayıb istiğazə eləsinlər ki, Allah-taala təzədən qızıl öküzün cavanlığını özünə qaytarsın. Yoxsa bu gün-sabah dünya alt-üst olar.

*Yer qurdu*

---

## FELYETON
## MARALLARIM

Hər dəm bə libasi-digər an mar bəraməd:
Gəh gürzə ilan şüd,
Gəh mərsiyəxan şüd,
Gəh afəti-can şüd,
Gəh molla flan şüd,
Gəh konsulü xan şüd...

Qalə mövlana Fazili–niranə əleyhişşərbətü və kəbab fi kitabi-Məcməül-müzəxrəfat: «Əddəcalül» məhbusun fi təhti-bəhril-Xəzər», yəni Dəccal Kaspi dənizinin altında dustaqdır.

Şəkkakə lənət! Kaspi dənizinin kənarında Ənzəli ilə Həştərxan arasında bir xırdaca şəhər var, o şəhərin adı Dəccalabaddır. Dəccalabad marallarımı iki şeydən tanımaq olar: bir qulaqlarından, bir də papaqlarından. Qulaqları o qədər böyükdür ki, yayda yelpiyə ehtiyacları yoxdur. Hər kəs o qulaqları ilə üzünü yelləyir və papaqlarının ortasını həmişə qabağa geyirlər. Dəccalabad marallarım çox dindardırlar: ilin on bir ayını ağlayırlar, ona görə Dəcalabaddan mərsiyəxan əskik olmur. İran dursun qıraqda, hələ Qarabağdan da mərsiyəxan gəlir. Bildir bir nəfər Qaryagin mahalından gəlib Dəccalabadda bir ay mərsiyə oxuyub min manat pul almışdır. Axırda bir gecə cənab axundun bir dul övrətə «elmi-izdivac»dan leksiya oxuduğunu görüb, hərçənd bədgüman olub bir qədər incitmişdilər, amma sora həqiqəti anlayıb axundu ehtiram ilə yola salmışdılar. Belə danışırdılar ki, ehtiram vaxtı axundun iki qabırğası sınıb, papağı da yox olub. Nə eybi var, millət yolunda iki qabırğanın nə artıq maliyyəti var?

Məhərrəm ayında marallarım məscid həyətində təkyə saxlarlar. Məscidin böyük meydan tək həyəti var və həyətin dörd ətrafı hücrələrdir. Bu hücrələrin hamısında mərsiyə oxunur. Hücrələrin qabağına dairə taxta çalıblar və taxtaların üstünə yüzətən içi su ilə dolu teştlər düzürlər. Hər maralım o teştlərin yüzünü də öpməyi özünə fərz hesab edir. Övrətlər isə teşti öpəndən sora suyun içinə pul da salır. Sora şeyxlər gəlib o pulları yığırlar: hər gün on beş, iyirmi manat cəm olur. Məhərrəmdə neçə günü peydərpey şeyxlər gəlib teştlərə baxıb pul tapmayıblar. Sora məlum olur ki, ağacı qurd içindən yeyir. Bir gün məscidin yanından ötərkən gördüm ki, böyük izdiham və qışqırtı var; yumruq dolu kimi yağır. Əvvəl belə güman etdim ki, camaat mərsiyənin təsirindən başlarına döyürlər. Yaxına gəlib gördüm ki, yumruqlar hamısı bir maralın başına dəyir. (Mabədi var.)

*Ceyranəli*

---

## İNSAFLI MOLLA

Mən ömrümdə çox molla görmüşəm və çox mollalar ilə dostluq da eləmişəm və məclislərdə həmişə özümü mollaların yanına verirəm, çünki o cənabların qabağına gələn məcməilərdə hər nə ürəyin istəsə tapılır. Paho! Mətləbdən uzaq düşdük. Bəli, doğrudan mən çox molla görmüşəm, amma Borçalı uyezdində Qızıl kəlisa kəndinin mollası Molla Əhməd kimi insaflı və mürüvvətli molla görməmişəm. Keçən Qurban bayramının günü mənim yolum haman kəndə düşdü. Gördüm hər evin qapısında bir qurbanlıq qoyun saxlayıb müntəzir durublar. Soruşdum ki, balam, daha nəyi gözləyirsiniz? Qurbanlarınızı

kəsin, bəlkə biz də cigər kababından-zaddan təpişdirək. Bu halda əlində kabab şişi təmizləyən tapansaqqal bir kişi başını yuxarı qovzayıb dedi ki, ağrın alım, qurbanı biz özümüz kəsə bilmərik, gərək mollamız gəlib kəssin. Bu vaxt gördüm ki, keçisaqqal bir adam bir əlində pıçaq və bir əlində dua kitabı gəlir. Ev sahibi bunu itlərdən ötürəndən sora qurbanlıq qoyunu gətirib bunun qabağında yıxdı yerə. Molla Əhməd pıçağı daşa sürtə-sürtə başladı ki, Nəsib dayı, mən qabaqca sənə deyirəm, qoyunun başı, döşü və dərisi şəriət ilə mənə çatır. Əgər verməsəniz əlimi vuran deyiləm. Nəsib dayı dedi ki, ay molla, başına dönüm, harasını aparırsan apar, ancaq döşünə dəymə. Bunu eşidəndə dedim ki, ay əmi, qurbanın döşünü molla yeməsə, o qurban qəbul olmaz. Ələlxüsus ki, belə insaflı molla. Keçisaqqal məndən bu sözü eşidən kimi üzünü mənə tutub dedi ki, a kişi, belə nainsaf camaat olmaz, mənim kimi mollanın qədrini bilmirlər. Nigahın birini bunlara on manata kəsirəm, genə məndən narazı qalırlar. Mən başıma nə daş salım? Dedim: ay molla, heç ürəyini sıxma, qurbanın döşünü yeyəndə yadından çıxar.

*Yoldanötən*

---

## DƏYƏNƏK

Bir rübaidə dörd qələt buraxır,
Barəkallah, bizim müsəhhihlər.

Belə getsə cəraidi-Qafqaz
İşləri büsbütün tamam eylər...

*Cüvəllağı bəy*

---

## POÇTA QUTUSU

İstanbulda «Cığatay» bəyə: Göndərdiyiniz şəkillərin biri bizə qəbuldur, qalan ikisini gərək Xoy erkəkxanasına göndərəydiniz.

---

Tiflisdə «Kabla filankəs»ə: Yazırsınız ki, Naxçıvandan gələn mərsiyəxan həmişə kefli olur, onun mərsiyəsinə ağlamaq olar, ya yox? Əfəndim, bizim eşitdiyimizə görə o cənab bu qabaqda olan qırx günü içməyi and içib tövbə etmişdir. Hələliyə ki, hər nə desə ağlamaq olar.

---

Naxçıvanda «Kələm satan»a: Əl-ayaq elə, hava getdikcə soyuyur.

---

İrəvanda «Süpürgəsaqqal»a: Hələ səbr elə, kişinin arvadı birdir.

---

Qazaxda «Qundaqsaz» imzası ilə yazana: Dostun ilə bir də mərc eləsən, biz də şərik olarıq. Ancaq Salahlı kəndinin mollalarına heç dolaşma, onlar sənin tayın deyil.

---

Aşqabadda «Şarlatan»a: Molla Ağa barəsində yazdığınızı oxuduq. Sora Molla Ağaya yazdıq ki, sənə bir ad qoysun ki, bundan sora bizə kağız yazanda adını yazasan.

---

Tiflisdə «Millət» imzalı şer yazana: Əfəndim, şerinizi göndərdik «Bəyanül-həqq» idarəsinə.

---

Qutqaşından kağız yazana: Barama oğruları olan iki Hacı bu il məhərrəmlikdə and içdilər ki, daha gələn ildən oğruluq eləməsinlər. Arxayın ol.

***Müvəqqəti müdir: Məhəmmədəli Sidqizadə***

## ELANLAR




Yumruq: Qorxma, get! Mən sənə deyirəm get! Hər kəs dinsə, dişlərini tökərəm!
Barmaq: Gəl, gəl! Heç qorxma, gəl! (Rəhim xanın İrana getməsi.)

Azərbaycan Milli Elmlər Akademiyası
Nizami adına Ədəbiyyat İnstitutu

# MOLLA NƏSRƏDDİN

**On cilddə**
**(1906-1931)**

**III cild**

**1909 (№№ 23-52) - 1910-cu illər**

NƏŞRİYYAT REDAKTORU
*Akif Dənzizadə,*
*Deniz İzuf,*
TEXNİKİ REDAKTORLAR
*İlham Əliyaroğlu,*
*Sakit Əmiraslanov,*
*Ceyhun Tağıyev,*
KORREKTORLAR
*Rəfiqə Qənbərqızı,*
*Fəridə Ələsgərli,*
*Gülarə Qədirli,*
OPERATORLAR
*Elnurə Abışova,*
*Ramilə Əliyeva,*
*Məlahət Qurbanova,*
ÇAPA MƏSUL
*Sərraf Mürsəlov,*
*Anar Abdullayev,*
*Azər Yunusov,*
*Cavad Əliyev.*

Yığılmağa verilmiş 05.12.2002,
çapa imzalanmış 10.08.2005,
formatı 70x100 1/8,
fiziki ç.v 87,5 şərti ç.v. 112,9
ofset kağızı №1, tayms qarnituru,
sifariş K3 Sayı 700

*Kitab*
***"ÇİNAR-ÇAP"** nəşriyyatında*
*nəşrə hazırlanmış*
*və*
*ofset üsulu ilə çap olunmuşdur.*

**✉ AZ1025. Bakı şəhəri, Xocalı pr., 24.**
**☎ Tel.: (+99412) 4989555, 4937255**